Jurnal 01.03.2021-ci ildə Azərbaycan Respublikası Ədliyyə Nazirliyi Mətbu nəşrlərin reyestrinə daxil edilmişdir.
Reyestr № 4336

The journal is included in the register of Press editions of the Ministry of Justice of the Republic of Azerbaijan on 01.03.2021.
Registration № 4336

**Redaksiyanın ünvanı**
AZ1073, Bakı şəh.,
Mətbuat prospekti, 529,
“Azərbaycan” nəşriyyatı,
6-cı mərtəbə

**Editorial address**
AZ1073, Baku,
Matbuat Avenue, 529,
“Azerbaijan” Publishing House,
6-th floor

**Tel.:** +994 50 209 59 68
+994 99 807 67 68
+994 99 808 67 68
+994 12 510 63 99

**E-mail:**
tedqiqat.1707@aem.az

## Beynəlxalq indekslər / International Indices

**e-ISSN: 2789-6919**
**DOI: 10.36719**

## RİYAZİYYAT VƏ MEXANİKA

**Prof. Dr. Eldar VƏLİYEV**, Milli Texniki Universitet / Ukrayna
**Prof. Dr. Eldar MƏSİMOV**, Bakı Dövlət Universiteti / Azərbaycan
**Prof. Dr. Maarif CƏFƏROV**, Bakı Dövlət Universiteti / Azərbaycan
**Assoc. Prof. Dr. Allahverdi CƏFƏROV,** Azərbaycan Dövlət Pedaqoji Universiteti / Azərbaycan
**Assoc. Prof. Dr. Rövşən HÜMBƏTƏLİYEV,** Azərbaycan Dövlət Dəniz Akademiyası / Azərbaycan
**Assoc. Prof. Dr. Ramazan EYYUBOV,** Bakı Dövlət Universiteti / Azərbaycan
**Assoc. Prof. Dr. Lalə QOCAYEVA,** Gəncə Dövlət Universiteti / Azərbaycan
**PhD Seymur MEŞAİK**, Gəncə Dövlət Universiteti / Azərbaycan

## TEXNİKA ELMLƏRİ

**Prof. Dr. Fəxrəddin YUSUBOV,** Azərbaycan Texniki Universiteti / Azərbaycan
**Prof. Dr. Cəlaləddin MƏMMƏDOV**, Azərbaycan Dövlət Aqrar Universiteti / Azərbaycan
**Prof. Dr. Valeriy LİSENKO**, Ümumrusiya Meteoroloji Xidmət Elmi-Tədqiqat İnstitutu / Rusiya
**Prof. Dr. Şahlar BABAYEV**, Azərbaycan Dövlət Aqrar Universiteti / Azərbaycan
**Assoc. Prof. Dr. Rafiq İBRAHİMOV**, Azərbaycan Dövlət Neft və Sənaye Universiteti / Azərbaycan
**Assoc. Prof. Dr. Elov BOTİR**, Ə.Nəvai adına Daşkənd Dövlət Özbək Dili və Ədəbiyyatı Universiteti / Özbəkistan
**Assoc. Prof. Dr. Şirin BAXŞƏLİYEVA,** Azərbaycan Dövlət Neft və Sənaye Universiteti / Azərbaycan
**PhD Rafiq AĞAMALIYEV,** Milli Aerokosmik Agentliyi, Təbii Ehtiyatların Kosmik Tədqiqi İnstitutu / Azərbaycan
**PhD Aygün BAYRAMOVA,** Milli Aerokosmik Agentliyi, Təbii Ehtiyatların Kosmik Tədqiqi İnstitutu / Azərbaycan

**HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR**

**HUMANITIES AND SOCIAL SCIENCES**

https://doi.org/10.36719/2789-6919/39/9-14

**Malahat Abdullayeva**
Azerbaijan State Pedagogical University
doctor of Philosophy in Pedagogy
azeriteacher@yahoo.com
https://orcid.org/0000-0002-2228-1224

# On the Activity of Students in Mathematics Lessons the Effect of the Pygmalion Effect

**Abstract**

The application of mathematical sciences has a great role in the development of society. Mathematical education is a necessary and important part of general education. Therefore, strengthening the mathematical preparation of students is considered the most important task facing secondary schools.

Mathematics is taught in a wide range of programs at every level of education in secondary schools. However, it is not perceived in the same way by all students. While some students find mathematics easy to understand, others find it very difficult. There are several reasons for this: poor mastery of mathematical concepts from primary classes, genetic influences, student's lack of independent work, concepts becoming more complex from class to class, age level, environment.

We must keep in mind that it is impossible to succeed in life without understanding mathematics. Therefore, it is necessary to look for the cause of difficulties and try to eliminate them. The purpose of the research is to study the impact of the Pygmalion effect on students' performance in mathematics lessons in secondary schools. Using the Pygmalion effect directs students with a poor understanding of mathematics to positive thinking and creates interest in learning mathematics. Many empirical studies also support the predictions of the Pygmalion effect, but it has been found that its effect sizes can vary from low to moderate.

As a result of the research, we concluded that applying the Pygmalion effect in teaching mathematics is one of the best ways to achieve success. The research will be useful for mathematics teachers and parents as well as a contribution to the relevant literature.

***Keywords**: Pygmalion effect, mathematics, student, positive thinking*

**Məlahət Abdullayeva**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
pedaqogika üzrə fəlsəfə doktoru
azeriteacher@yahoo.com
https://orcid.org/0000-0002-2228-1224

# Riyaziyyat dərslərində şagirdlərin fəaliyyətinə piqmalion effektinin təsiri

**Xülasə**

Cəmiyyətin inkişafında riyazi elmlərin tətbiqinin böyük rolu vardır. Riyazi təhsil ümumi təhsilin zəruri və mühüm hissəsini təşkil edir. Buna görə də şagirdlərin riyazi hazırlığının gücləndirilməsi ümumtəhsil məktəbləri qarşısında duran ən mühüm vəzifə hesab olunur.

Riyaziyyat fənni ümumtəhsil məktəblərinin hər bir təhsil səviyyəsində geniş proqram üzrə tədris olunur. Lakin buna baxmayaraq, bütün şagirdlər tərəfindən eyni şəkildə qavranılmır. Bəzi şagirdlər üçün riyaziyyatı anlamaq asan olduğu halda, digərləri üçün çox çətindir. Bunun bir neçə səbəbi

vardır: ibtidai siniflərdən riyazi anlayışların zəif mənimsənilməsi, genetik təsirlər, şagirdin müstəqil çalışmaması, anlayışların sinifdən-sinfə mürəkkəbləşməsi, yaş səviyyəsi, ətraf mühit.

Nəzərə almalıyıq ki, riyaziyyatı anlamadan həyatda uğur qazanmaq mümkün deyildir. Deməli, çətinliklərin səbəbini axtarmağa və onu aradan qaldırmağa çalışmaq lazımdır.

Tədqiqatın məqsədi ümumtəhsil məktəblərin riyaziyyat dərslərində şagirdlərin fəaliyyətinə Piqmalion effektininin təsirini öyrənməkdir. Piqmalion effektindən istifadə riyaziyyatı zəif anlayan şagirdləri pozitiv düşünməyə istiqamətləndirir, onlarda riyaziyyatı öyrənməyə maraq yaradır. Bir çox empirik tədqiqatlar da Piqmalion effekti ilə bağlı proqnozları dəstəkləyir, lakin müəyyən edilmişdir ki, onun təsir ölçüləri aşağı səviyyədən orta səviyyəyə qədər dəyişilə bilir.

Tədqiqat nəticəsində belə qənaətə gəldik ki, riyaziyyatın tədrisində Piqmalion effektini tətbiq etmək uğur qazanmaq üçün ən yaxşı yollardan biridir. Araşdırma müvafiq ədəbiyyata töhfə olmaqla yanaşı, riyaziyyat müəllimləri və valideynlər üçün faydalı olacaqdır.

***Açar sözlər:*** *Piqmalion effekti, riyaziyyat, şagird, pozitiv düşüncə*

## Introduction

The application of mathematical sciences has a great role in the development of society. It is known that the foundation of mathematical sciences is laid in general education schools and continued in later periods.

Mathematical education is a necessary and important part of general education. Therefore, strengthening the mathematical preparation of students is considered the most important task facing secondary schools. Mathematics training develops students' logical thinking, memory, attention, imagination, observation, will, independence and creative initiative.

In the learning process, students learn that the objects of mathematics are quantitative relationships with spatial forms of the real world, and mathematical concepts are taken from life. Starting from the first years of education, students develop the ability to move from concreteness to abstraction, thereby laying the foundation for the development of abstract thinking. Habits are formed such as making correct generalizations, drawing logical conclusions from a given proposal, and applying the results obtained from theoretical judgments to practice. Mathematics classes open up great opportunities for students to acquire qualities such as clarity of thought, justification of speech accuracy, and brevity. All these qualities arise and are formed if there is a positive psychological environment in mathematics classes.

## Research

The subject of mathematics is taught in general schools at each educational level according to a wide program (Ministry of National Education of Azerbaijan, 2013). However, it is not perceived in the same way by all students. There are several reasons for this: poor assimilation of mathematical concepts from elementary grades, genetic influences, the student's lack of independent work, age level, environment, etc. On the other hand, the number of subjects taught in general education schools increases from grade to grade, and the choice of profession and preparations in this direction leads to a decrease in the number of students studying mathematics. Some students are not interested in learning mathematics at all.

It is impossible to succeed in life without understanding mathematics. So what to do? How to make students interested in mathematics?

### Purpose and significance of the study

The purpose of the research is to study the effect of the Pygmalion effect on the performance of students in mathematics classes in secondary schools.

The Pygmalion effect was experimentally proven for the first time by the American psychologist Robert Rosenthal (Rosenthal and Jacobson, 1968). The Pygmalion effect is that high expectations lead to improved performance in a given area, while low expectations are a psychological phenomenon that causes worse (Mitchell and Daniels, 2003). The Pygmalion effect is a phenomenon in which a person who is sure of the integrity of any information involuntarily behaves in such a way that in the end that information finds its confirmation.

The most convincing evidence of the Pygmalion effect is an experiment conducted in 1968 by

psychologists Robert Rosenthal and Leanor Jacobson. Psychologists talk about interesting experiences about the power of communication in their book "Pygmalion in the Classroom". Rosenthal first tests the IQ of elementary school students. Then, he gives the names of the students he randomly selected from among these children to their teachers, stating that those students have higher potential and talent than other students. In reality, they were no different from other students and were chosen at random. On intelligence tests conducted a year later, those "high-potential" students, Rosenthal says, did indeed show higher academic performance and even increased their IQ scores by 4 points. There was no noticeable change in other students (https://www.tipii.edu.az-/az/article/477-tahsilda-pygmalion-effekti).

Rosenthal explained the reason for this as follows: Teachers were more interested in "high-potential students" and made them feel their feelings through words, facial expressions, and body language. Thus, this positive expectation of teachers towards students affected their consciousness, increased their motivation and ability to understand, and achievement was inevitable.

Research by Robert Rosenthal and Lenore Jacobson showed that if teachers were forced to expect high performance from children, children's performance would increase. Likewise, if teachers were forced to expect less from children, then children's performance would decline. Therefore, the influence of teachers on the activity of students also affects the results expected from them.



Figure 1.

Research on the Pygmalion effect proves that it is very effective in management, parent-child relationships, and especially teacher-student relationships.

**Method**

The 10th graders of the general education school were selected to study the influence of the Pygmalion effect on the performance of students in mathematics lessons. In the training process, the Pygmalion effect was applied, a test was conducted, and a result was obtained based on the collected data. The research was conducted using a qualitative approach.

***Example* 1:** The research was conducted in the 10th grade of secondary school No. 21 in Baku. I present to the readers an example of research conducted during one academic year. 22 students study in the class. The topic is "Solution of problems related to the theorem of cosines". Purpose "3.1.1. Solves triangles using the theorems of sines and cosines" is the achievement of learning outcomes related to the realization of the content standard. After the explanation of the theorem of cosines, we perform the research task together. Then I ask the students to individually solve a problem from the learning tasks section. The time for solving the issue is determined.

***Problem 1:*** BT is bisector in ΔABC.
If $AB = 4$, $BC = 8$, $AC = 9$, then the quotient of $BT$ find its length by following the given steps (Kahramanova, et. al., 2022).

1. Find the length of segments $AT$ and $TC$.
2. Find $\cos\angle A$ from ΔABC.
3. Find $BT$ from ΔABT (Figure 1).

**Data Analysis**

After the time given for solving the problem, I check the students' answers. Six students refused to solve the problem, eight students answered incorrectly, four students partially correct, and four students solved it correctly (Table 1).

***Table 1.***

| Criteria / Participants | There is no solution | Wrong answer | Partially correct answer | Correct answer | Total |
|---|---|---|---|---|---|
| Number of students in numbers | 6 | 8 | 4 | 4 | 22 |
| Number of students in percentage | 27% | 37% | 18% | 18% | 100% |

I suggest students who did not solve the problem correctly to solve it again. But they refuse to solve the problem. Why don't you want to solve it? - the answers to the question were as follows:

- It is a very difficult issue;
- I can't solve a geometry problem;
- I haven't solved such a problem, so I can't solve this either;
- I don't understand math, etc.

The reason is very simple - most students in math problem-solving classes think negatively.



Figure 2.

“You are stronger than everyone else”, “you can solve this task”, “if you repeat the theoretical material, you will solve it easily”, “I believe you can”, “this is a task you can do”, “solve it together with your friends”, “draw a picture of the problem, you will be able to solve it”, “write as much as you can”, “don't hesitate to express your thoughts”, etc. I guide the students to think positively by using expressions like.

After having a conversation with the students that could create positive thinking, the students who did not solve the problem correctly decided to solve the work again. Students who solved the problem correctly were given a new task. The time has been determined. The students tried to solve the problem with great enthusiasm. Some students used the textbook, and some consulted with their friends. The effect of the Pygmalion effect was manifested. The results were significantly different from before: the number of correct solvers increased by 2, the number of partial solvers increased by thirteen, the number of incorrect solvers increased by three, and there were no refusers (Table 2).

***Table 2.***

| Criteria / Participants | There is no solution | Wrong answer | Partially correct answer | Correct answer | Total |
|---|---|---|---|---|---|
| Number of students in numbers | 0 | 3 | 13 | 6 | 22 |
| Number of students in percentage | 0% | 14% | 59% | 27% | 100% |

***Example* 2:** Students wanted to test themselves with new work. After having a conversation with the students that can create positive thinking, they decided to solve the work in group form. Groups of students with weak, medium, and strong mathematical understanding were organized. The groups were presented with the second task on the worksheets. 5 minutes time was determined for solving the work.

***Problem 2:*** *BM* is the median in *ΔABC*. If *AB* = 4, *BC* = 8, *AC* = 10, find the length of the median BM (Figure 2). (Kahramanova et. al., 2022).

I observe the work of the groups from the moment the work is solved. Students politely listen to each other, students who are able to solve the work help those who feel the need, and students who have difficulty solving the work make notes in their notebooks, repeat the theoretical material, and

try to understand something. Group members tried to solve the task cooperatively. When the time is up, each group happily presents the worksheets with the complete solution to the task. The joy on the faces of the students was a reflection of their activity.

## Results

The Pygmalion effect had an effect on the students' activity. Every student was happy as if they had succeeded. It was known that not everyone solved the given task correctly, but every student had a share in solving the task.

Considering that there are students in the groups who solve the task freely, solve it with help and cannot solve it, I came to the conclusion that the solution of the task is obtained from the positive emotions of these three types of students.

It is necessary to identify all the didactic opportunities that can create positive thinking in students in solving mathematical problems and take them into account in the teaching process. But we will think positively, hear positively, and solve correctly, only in this case it is possible to create cognitive activity in students and develop thinking operations.

Psychological service is one of the organic components of the modern education system. Its application should ensure timely discovery of children's intellectual capabilities, personality-oriented potentials, natural capabilities, abilities, interests, and inclinations, and maximum development through training and education processes.

In order for the active cognitive position of students to remain at the appropriate level, it is necessary for teachers to be compassionate towards each student, treat them with respect, have an individual attitude, and feel the environment in the classroom with special sensitivity. Trusting the student, treating him with respect, and refusing to evaluate his answers badly will create a sense of self-confidence, respect, and trust in each student. So, using the Pygmalion effect plays a big role in creating interest in learning mathematics among students.

## Conclusion

Observations show that positive thinking in mathematics teaching is very important for completing the given task. On the one hand, this creates motivation within the student, at this moment the brain becomes active, the effect of brain power helps to overcome difficulties. On the other hand, the student does not hesitate to freely express what he knows, looks for solutions together with his peers, thinks independently, analyzes, predicts, judges, compares and tries to get the right result. Positive thinking creates a dependency and connection between the student and mathematical work. The student does not give up on the task until it is completed. He thinks that even the most difficult task is a task that he can perform, he gains confidence. Solving the task becomes the goal.

The student becomes courageous, decisive and thus has creative power. When he thinks that he got the result according to his power, then it makes him more happy. He dreams and makes his dreams come true. The positive energy of such students has a positive effect on others.

It is possible to develop the thinking of not only strong students, but also weak students by creating a sense of self-confidence in students in solving tasks that are difficult to understand. Therefore, it is appropriate for teachers to use the Pygmalion effect in mathematics lessons.

The human brain is an organ that accepts what we tell it without question. It will try to do whatever we put on it. Therefore, in the teaching of each subject, especially in mathematics lessons, we must train the students' brains to positive thinking. Students' interests and inclinations should be taken into account, and we should create conditions for them to succeed. Thus, applying the Pygmalion effect in teaching mathematics is one of the best ways to succeed.

## References

1. Mathematics education program (curriculum) for secondary schools of the Republic of Azerbaijan (grades I-XI) (2013).
2. Rosenthal, R., Jacobson, L. (September 1968). Pygmalion in the classroom. *The Urban Review*. 3 (1): 16–20. doi:10.1007/BF02322211. https://link.springer.com/article/10.1007/BF02322211
3. Mitchell, T., Daniels, D. (2003). "Motivation". In Walter C. Borman; Daniel R. Ilgen; Richard J. Klimoski (eds.). *Handbook of Psychology* (volume 12). John Wiley & Sons, Inc. p. 229. ISBN 0-471-38408-9 https://www.researchgate.net/publication/278393145_Motivation
4. Friedrich, Alena & Flunger, Barbara & Nagengast, Benjamin & Jonkmann, Kathrin & Trautwein, Ulrich. (2014). Pygmalion effects in the classroom: Teacher expectancy effects on students' math achievement. *Contemporary Educational Psychology*. 41. 10.1016/j.cedpsych.2014.10.006. https://www.researchgate.net/publication/268690690_Pygmalion_effects_in_the_classroom
5. Szumski, G., Karwowski, M. (2019). Exploring the Pygmalion effect: The role of teacher expectations, academic self-concept, and class context in students' math achievement. *Contemporary Educational Psychology*. Volume 59, October, 101787 https://www.sciencedirect.com/science/article/abs/pii/S0361476X18300729
6. Kahramanova, N., Karimov, M., Huseynov, I. (2022). *Mathematics textbook for the 10th grade of secondary schools*. Education Publishing House-Polygraphy.
7. https://muhaz.org/riyaziyyat-ve-pozitiv-dusunmek-1-doc-dr-melahet-abdullayeva.html
8. https://www.tipii.edu.az/az/article/477-tahsilda-piqmalion-effekti
9. https://en.wikipedia.org/wiki/Pygmalion_effect

Received: 07.09.2024
Submitted for review: 23.09.2024
Approved: 08.11.2024
Published: 30.11.2024

https://doi.org/10.36719/2789-6919/39/15-18

**Türkan İsmayıllı**
Naxçıvan Dövlət Universiteti
filologiya üzrə fəlsəfə doktoru
ismayilliturkanmehrac@gmail.com
https://orcid.org/0009-0009-1687-6203

# İngilis və Azərbaycan dilində durğu işarələri

**Xülasə**

Bu məqalənin məqsədi ingilis və Azərbaycan dilində durğu işarələri mövzusunu nəzərdən keçirmək, yazılı mətnin mənasını başa düşmək üçün durğu işarələrindən istifadə etməyin vacibliyini göstərməkdir. Həmçinin məqalədə ingilis və Azərbaycan dilində durğu işarələrinin oxşar və fərqli cəhətlərinə toxunulmuş, nümunələrlə izah edilmişdir. Vurğulanır ki, durğu işarələri yazılı nitqin formalaşmasında mühüm bir vasitədir və kommunikativ funksiyaya malikdir.

***Açar sözlər:*** *durğu işarələri, yazı dili, sadə cümlə, mürəkkəb cümlə, intonasiya*

**Turkan Ismailli**
Nakhchivan State University
Doctor of Philosophy in Philology
ismayilliturkanmehrac@gmail.com
https://orcid.org/0009-0009-1687-6203

# Punctuation in English and Azerbaijani

**Abstract**

The purpose of this article is to review the topic of punctuation in English and Azerbaijani and to show the importance of using punctuation to understand the meaning of a written text. The article also analyzes the similarities and differences of punctuation marks in English and Azerbaijani and explains them with examples. It is emphasized that punctuation marks are an important tool in the formation of written speech and have a communicative function.

***Keywords:*** *punctuation marks, written language, simple sentence, complex sentence, intonation*

## Giriş

Dilin, dilçiliyin elə sahələri var ki, onlar daha çox mütəxəssislərin marağına daxildir, onların araşdırmalarının obyekt və predmeti kimi götürülür. Bunlar sırf elmi-nəzəri problemlərdir: morfologiya, sintaksis, leksikologiya, etimologiya, semantika, habelə qrammatikanın bir sıra başqa məsələləri və s. Amma dilçilik elminin əməli, tətbiqi sahələri, bölmələri də var ki, yalnız dilçi alimlərə, mütəxəssislərə deyil, bütövlükdə tədris işi ilə məşğul olan, ondan həmişə istifadə edən bütün insanlara: hüquq, təhsil, mətbuat, mədəniyyət, siyasət, iqtisadiyyat və b. sahələri təmsil edən şəxslərə də lazımdır (Palmer, 12). Bunların sırasına nitq mədəniyyəti, dilin orfoqrafiya (imla) qaydaları, orfoepiya (ədəbi tələffüz) məsələləri, dildə işlənən durğu işarələri (geniş mənada bu işarələrdən istifadə qaydaları və ya bu qaydaların məcmuyu – başqa cür desək, punktuasiya) daxildir.

## Tədqiqat

Durğu işarələri nitq prosesində meydana gələn durğuları, fasilələri yazılı nitqdə bildirmək üçün işlədilir. Durğu işarələrini səciyyələndirsək, belə bir ümumiləşdirici fikirlə onu təqdim edərdik ki, durğu işarələri yazılı nitqin formalaşmasında mühüm bir vasitədir və kommunikativ funksiyaya malikdir. Həmçinin yazılı dilin məzmun dolğunluğunun yaranmasında, fikrin dəqiq və emosional təsir gücünün üzə çıxmasında və aydın və ifadəli tələffüzündə durğu işarələrinin rolu böyükdür (Ismailli, 4). Durğu işarələri yazılı nitqi mənalı hissələrə bölür. Məsələn, nöqtə işarəsi cümlədə

*Elmi Tədqiqat* Beynəlxalq Elmi Jurnal. 2024 / Cild: 4 Sayı: 11 / 15-18
*Scientific Research* International Scientific Journal. 2024 / Volume: 4 Issue: 11 / 15-18 e-ISSN: 2789-6919

fikrin bitdiyini bildirir, həmcins üzvlər arasında vergül qoyulması bu üzvlərin cümlədə bərabərhüquqlu olduğunu göstərir. Bir qisim durğu işarələri sözlər arasında mövcud olan əlaqələri, nitqə xas olan intonasiyaları, dildə tarixən baş vermiş bu və ya digər dəyişikliyi göstərmək üçün işlədilir. Məsələn, apastrof istər Azərbaycan dilində, istərsə də ingilis dilində hər hansı bir səsin söz tərkibində tarixən işləndiyini, lakin dillərin müasir inkişaf mərhələsində həmin səsin, yaxud səslərin bu söz tərkibindən düşdüyünü göstərmək üçün işlədilir.

İngilis dilində 14 durğu işarəsi mövcuddur: nöqtə (full stop/period/dot), vergül (com-ma), iki nöqtə (colon), nöqtəli vergül (semi-colon), sual işarəsi (question mark), nida (exclamation point), tire (dash), defis (hy-phen), mötərizə (parentheses): kvadrat mötərizə (brackets), dairəvi mötərizə (braces), apostrof (apostrophe), dırnaq işarəsi (quota-tion marks), ellips (ellipsis).

*Nöqtə* (full stop/period/dot). Bu, ən sadə durğu işarəsidir. Çox vaxt bir tam cümləni digərindən ayırmaq üçün istifadə olunur. Amerika ingilis dilində nöqtə "dot" olaraq adlandırılır. Şifahi nitqdə rəqəmləri ifadə edərkən nöqtə "point" adlanır. Məsələn: 13.12 = thirteen point one two. Nöqtə cümlənin bitdiyini bildirir, adətən, nəqli cümlənin sonunda işlənir. *He could not come to the party.*

*Vergül (comma)* Azərbaycan dilində olduğu kimi, ingilis dilində də vergül işarəsi nitqdə mövcud olan ən qısa durğunu bildirir. Bu durğu işarəsi ingilis dilini öyrənənlər üçün daha çox çətinlik yaradır (The Oxford English Dictionary, 1989). Onun istifadəsi üçün kifayət qədər qayda var və bununla bağlı artıq ətraflı məqalələr mövcuddur. Vergül cümlə strukturunda sözləri, fikirləri və ya cümlələri ayırmaq üçün istifadə olunan durğu işarəsidir. Yersiz qoyulmuş və ya çatışmayan vergül bütün cümlənin mənasını dəyişə bilər və yazılanların səhv başa düşülməsinə səbəb ola bilər. Sadə cümlə tərkibində həmcins üzvlərin arasında vergül işarəsi qoyulur; *She smiled, nodded and took the plates.*

*a)* Qoşa-qoşa işlənən həmcins üzvlər arasında vergül işarəsi qoyulur; Day by day, month after month I was coldly neglected.

*b)* Xitab, ara sözlər və ara cümlələr cümlənin əsas hissəsindən vergül işarəsi ilə ayrılır. There were others, *as he knew*, who would speak for him.

*c)* Well, therefore, however, too, then, finally və s. sözlər cümlənin əsas hissəsindən vergül işarəsi ilə ayrılır.

Finally, my students passed the exam successfully.

*Yes* və *no* sözlərindən sonra vergül işarəsi qoyulur.

Yes, of course.

Azərbaycan dilində vergül tabesiz və tabeli mürəkkəb cümlələr arasında və xitab və ara sözlərin müxtəlif tərəflərində işlənir. *Ana, qırmızı rəng, bilirsən, mənə necə yaraşır?!*

*İki nöqtə (colon).* Bu işarə sadalanacaq siyahının əvvəlində və ya müəyyən aydınlaşdırmadan əvvəl qoyulur. İki nöqtə aşağıdakı hallarda qoyulur;

Vasitəsiz nitqdən əvvəl işlənən cümlələrdən sonra Soames said: "You"ll find it dry".

Əvvəlcədən deyilmiş fikir haqqında əlavə məlumatı dəqiqləşdirən söz və ya sözlərdən sonra; *There are four seasons in a year: autumn, winter, spring, summer.*

Yazılı nitqdə iki nöqtə işarəsi bir çox halda işlədilir və fikrin davam etdiyini bildirir. Yazın gözəl çağı idi: yer yamyaşıldı, bənövşə açmışdı, ağ və çəhrayı çiçəklər ağacları bəzəkli gəlinə döndərmişdi!

*Nöqtəli vergül (semicolon*). İngilis dilində bu işarə tematik olaraq əlaqəli, lakin bağlayıcısız ifadələri və cümlələri birləşdirmək üçün istifadə olunur (Jespersen, 18-20). Tabesiz mürəkkəb cümlənin tərkibində vergüllə ayrılan hissələr arasında da nöqtəli vergül qoyulur. Məsələn: I like summer; it's hot in summer.

*Sual işarəsi (interrogation mark).* Burada hər şey çox sadədir. Bu işarə bütün birbaşa sualların sonunda qoyulur və tabesiz cümlələrdə istifadə edilmir. Məsələn: How old are you?

Azərbaycan dilində sual işarəsi sual əvəzliklərinin, sual məqsədilə işlənən cümlələrin sonunda qoyulur. Bu cümlələr bütöv və ya elliptik ola bilir. Elliptik cümlə bir sözdən də ibarət olur və bu məqamda da sual işarəsindən istifadə olunur.

*Nida işarəsi (exclamation mark).* Təəccüb, qıcıqlanma və s. hiss ifadə etmək, həmçinin qısa, kəskin ifadələri vurğulamaq üçün də istifadə olunur. Nida işarəsi hiss, həyəcan bildirir, cümlələrin sonunda, əvvəlində və sonunda işlənə bilir.

What nonsense you talk! Məsələn: Wow! Help!

Azərbaycan və ingilis dilində bəzən sual cümləsi nida tonunda deyilir. Belə cümlələrin sonunda sual-nida işarəsi qoyulur. Məsələn:

Badam: – Paho, nə böyük adamsan, heç bilmirdik! Bu ixtiyarı sənə kim verdi?!

*Tire (The Dash)* Tire nitqdə edilən nisbətən uzun fasiləni bildirmək üçün, danışanın tərəddüd etdiyini və emosional nitqdə həmcins üzvlər arasında işlədilir.

It was nothing but a silly fancy of mine – quite absurd.

*İki tire (two – em dash)*

İngilis dilində fikrin bitmədiyi əsasən iki tire ilə işarə edilir.

“I should think so”, said James, I should – –

*Mötərizə (Bracktes)* Mötərizə ingilis dilində əsasən, ara sözləri və ya cümlələri cümlənin əsas hissəsindən ayırmaq üçün işlədilir.

“I’m so frightened that Stephan” (She refused to use her husband’s nickname).

Mötərizədən yazılı nitqdə aydınlaşdırıcı məlumat və ya izahat verilərkən istifadə olunur. Mötərizənin aşağıdakı formaları vardır:

1. Düz mötərizə – [ ]
2. Bucaq mötərizə – < >
3. Maili mötərizə – / /
4. Girdə mötərizə – ( )

Yazılı nitqdə mötərizədən, əsasən, elmi mətndə daha çox istifadə olunur. Bədii ədəbiyyatda da ən çox dram əsərlərində, remarkaların yazılışı mötərizə içərisində verilir.

Mötərizə aşağıdakı hallarda işlənir:

1. Elmi mətndə mötərizədən konkret termini göstərmək məqsədilə istifadə olunur: – İnsan öz əqli fəaliyyətində ya ayrı-ayrı faktlardan çıxış edərək ümumi nəticələrə (induksiya), ya da ümumidən ayrı-ayrı nəticələrə (deduksiya) gəlir.

*Defis (hyphen).* Defis sözləri birləşdirir. Bənzərliklərinə görə defis və tireni tez-tez qarışdırırlar. Tire hər iki tərəfindən ara ilə ayrıldığı halda, defisdən sonra ara qoyulmur. Məsələn: You think you are right – you aren’t.

*Apostrof (apostrophe).* Apostrof ən çətin durğu işarələrindən biridir. Problem ən çox onun ingilis dilində istifadəsinin səhv başa düşülməsindən yaranır (Lyons, 25). Apostrof ilk dəfə ingilis dilində XVI əsrdə ortaya çıxmışdır. Klassik mətnlərdə apostrof çatışmayan hərfləri ifadə edirdi. XVII əsrdə iki mənada istifadə olunmağa başladı: sahiblik və qısaldılma. Məsələn: my friend’s car, the Mamma-dovs’

*Çox nöqtə (A series of periods)* Çox nöqtə cümlənin sonunda işlədilir və fikrin bitmədiyini bildirir.

*Think I don’t know that? But Ted.....*

*– Doğrusu, dünənki firtına çox dəhşətli idi, – dedi. – Ancaq...*

*Dırnaq (The inverted commas)* Dırnaq vasitəsiz nitqin və ya sitatın əvvəlində və axırında qoyulur. Dırnaq işarəsi bir sözün, ifadənin, cümlənin, xüsusi adın başqasından fərqləndirilməsinə xidmət edir. Azərbaycan dilindən fərqli olaraq, ingilis dilində dırnaq həm əvvəldə, həm də axırda sətrin üstündə qoyulur. *Without looking up Joe said: “Maybe he had another girl friend”*

## Nəticə

Düzgün yazı bacarığına yiyələnməyin başlıca şərtləri durğu işarələrinin məqama uyğun işlədilə bilməsidir. Durğu işarələri düzgün oxuyub yazmaq, düşüncələrin başqalarına çatdırmaqda mühüm əhəmiyyət kəsb edir. Durğu işarələrinin bir qismi orfoqrafik, bir qismi isə sintaktik məna daşıyır. Onların bir qismi hissi, psixoloji vəziyyəti nəzərə çatdırmaqda ifadə və cümlələrin üslubunu emosional estetik çalarlarını göstərmək məqsədi ilə istifadə olunur. Yazılı dilin məzmun

dolğunluğunun yaranmasında, fikrin dəqiq və emosional təsir gücünün üzə çıxmasında və aydın və ifadəli tələffüzündə durğu işarələrinin rolu böyükdür.

## References


1. Genung, J.F., Charles, L.H. (1915). *Composition and Rhetoric*. Genn and Company.
2. Jespersen, O. (1976). *Essentials of English Grammar*. GeorgeAllen and Unwin Ltd.
3. Lyons, J. (1968). *Introduction to Theoretical Linguistics*. Cambridge University Press.
4. Palmer, F. (1971). *Grammar*. Penguin Books Ltd.
5. *The Oxford English Dictionary*. 2nd ed. (1989). Oxford.
6. The University of Chicago Press. (1959). *A Manual of Style*. University of Chicago Press.
7. Yerlikaya, A., Kanishli, E., & Bozdoghan, D. (2020). Career Application and Research Centers in Universities: Black Sea Region. *TOGU Career Research Journal*, 16-23.
8. Ismailli, T. The Concept Of Affırmatıveness In Lınguıstıcs And Phılosophıcal Studıes, http://dx.doi.org/10.32782/2710-4656/2022.4.1/45


Daxil oldu: 08.09.2024
Baxışa göndərildi: 27.09.2024
Təsdiq edildi: 23.10.2024
Çap olundu: 30.11.2024

*Elmi Tədqiqat* Beynəlxalq Elmi Jurnal. 2024 / Cild: 4 Sayı: 11 / 19-24
*Scientific Research* International Scientific Journal. 2024 / Volume: 4 Issue: 11 / 19-24 e-ISSN: 2789-6919

https://doi.org/10.36719/2789-6919/39/19-24

**Günel Mustafayeva**
Azərbaycan Respublikasının Ədliyyə Nazirliyinin
Ədliyyə Akademiyası
mustafayevagunel90@gmail.com

## Bazarın təhlükəsizliyi: Aİ-nin rəqabət təhriflərinə qarşı hüquqi çərçivəsi

### Xülasə

"Bazarın Təhlükəsizliyi: Aİ-nin Rəqabət Təhriflərinə Qarşı Hüquqi Çərçivəsi" məqaləsi Avropa İttifaqının vahid bazarında ədalətli rəqabəti təmin etməyi hədəfləyən hüquqi çərçivəsini geniş şəkildə izah edir. Məqalədə Avropa İttifaqının vahid bazarının effektiv fəaliyyətinin necə qorunduğu ətraflı müzakirə olunur. Əsas diqqət TFEU-nun 101, 102 və 107-ci maddələrinə yönəlmişdir. Bu maddələr rəqabəti məhdudlaşdıran razılaşmaların qarşısını almaq üçün mühüm hüquqi əsaslar yaradır. Bundan əlavə, dominant mövqeyə malik şirkətlərin bazar gücündən sui-istifadəsinin məhdudlaşdırılması bu maddələr çərçivəsində xüsusi əhəmiyyət kəsb edir.

Avropa İttifaqının rəqabət hüququ dövlət yardımlarının rəqabət mühitini təhrif etməsini də tənzimləyir. Dövlət yardımları iqtisadi tarazlığa təsir göstərə bildiyi üçün onların verilməsinə ciddi nəzarət edilir. Məqalədə həmçinin rəqabət hüququnun mərkəzi səviyyədə Avropa Komissiyası tərəfindən və milli səviyyədə üzv dövlətlərin rəqabət orqanları tərəfindən necə tətbiq olunduğu izah edilir. Bu, vahid hüquqi yanaşma ilə milli maraqların balanslaşdırılmasını təmin etmək məqsədini daşıyır. Müxtəlif mexanizmlər vasitəsilə Avropa İttifaqı, vahid bazarın rəqabətçi və səmərəli fəaliyyət göstərməsi üçün hüquqi baza yaradır. Məqalə, rəqabət hüququnun iqtisadi inkişafa təsiri və istehlakçıların rifahını artırmaq üçün hansı yollarla istifadə edildiyini geniş şəkildə müzakirə edir.

***Açar sözlər:*** *vahid bazar, rəqabət hüququ, dövlət yardımları, anti-rəqabət praktikası, Avropa İttifaqı*

.

**Gunel Mustafayeva**
The Academy of Justice of the Ministry of Justice
of the Republic of Azerbaijan
mustafayevagunel90@gmail.com

## Safeguarding Market Integrity: The EU's Legal Framework Against Competitive Distortions

### Abstract

The article "Market Security: The EU's Legal Framework Against Distortions of Competition" provides a comprehensive explanation of the European Union's legal framework aimed at ensuring fair competition within its single market. The article discusses in detail how the efficient functioning of the EU's single market is safeguarded. The primary focus is on Articles 101, 102, and 107 of the TFEU. These articles establish essential legal foundations for preventing agreements that restrict competition. In addition, the limitation of the abuse of market power by companies with a dominant position is emphasized as particularly significant within the scope of these provisions.

The EU's competition law also regulates the distortion of the competitive environment caused by state aid. Since state aid can impact economic balance, its provision is subject to strict oversight. The article further explains how competition law is enforced both centrally by the European Commission and at the national level by the competition authorities of the member states. This dual approach aims to balance a unified legal framework with national interests. Through various

mechanisms, the European Union establishes a legal basis for ensuring that the single market operates competitively and efficiently.

The article explores extensively how competition law influences economic development and the ways it is employed to enhance consumer welfare.

***Keywords:*** *single market, competition law, state aid, anti-competitive practices, European Union*

.

## Giriş

Avropa İttifaqının vahid bazar yaratmaq istəyi yalnız insanların və malların sərbəst hərəkətini məhdudlaşdıran milli qanunların aradan qaldırılması ilə məhdudlaşmır. Aİ başa düşür ki, bəzi özəl biznes təcrübələri və dövlət tərəfindən görülən müəyyən tədbirlər də daxili bazarın düzgün işləməsinə mane ola bilər. Xüsusilə, bizneslər arasında bölünən və rəqabətin məhdudlaşdırılmasına gətirib çıxaran razılaşmalar, bazarda üstün mövqeyə malik şirkətlərin birtərəfli hərəkətləri və müəyyən müəssisələrə dövlət tərəfindən verilən subsidiyalar ədalətli rəqabət və bazar səmərəliliyini poza bilər. Başlanğıcdan bəri, Aİ müqavilələrində bu məsələləri tənzimləyən maddələr, rəqabət hüququ olaraq bilinən müddəalar yer almışdır. Bu müddəalar Avropa İttifaqının Fəaliyyəti Haqqında Müqaviləsinin (bundan sonra TFEU) 101-ci və 109-cu maddələrində yer alır və Avropa İttifaqında rəqabətin tənzimlənməsi üçün hüquqi çərçivəni təmin edir (Treaty on the Functionin gofthe European Union.
https://eurlex.europa.eu/LexUriServ/LexUriServ.do?uri=CELEX:12012E/TXT:en:PDF).

101-ci maddə rəqabəti məhdudlaşdıran və əksərən kartel adlandırılan bizneslərarası razılaşmaları qadağan edir. Kartel anlaşmaları, adətən, qiymətlərin müəyyənləşdirilməsi, istehsalın məhdudlaşdırılması və ya bazarların bölüşdürülməsi üçün bizneslər arasında əldə edilən razılaşmalardan ibarətdir. Müntəzəm məhkəmə presedentlərinə əsasən, hüquqi statusundan və maliyyələşdirilmə üsulundan asılı olmayaraq, iqtisadi fəaliyyətlə məşğul olan istənilən qurum "təsərrüfat subyekti" hesab edilir (Case C-41/90, Klaus Höfner and Fritz Elser v. Macrotron GmbH." ECLI:EU:C:1991:161, para 21). Bununla yanaşı, TFEU bazarda üstün mövqeyə malik şirkətlərin sui-istifadə hallarına yol verməməsi üçün qaydalar da müəyyən edir. Bu sui-istifadə hallarına ədalətsiz qiymətlərin və şərtlərin müəyyən edilməsi, istehsalın məhdudlaşdırılması və ya rəqiblərin ədalətsiz şəkildə bazardan uzaqlaşdırılması aid edilə bilər. İqtisadi fəaliyyət bazar mühitində həyata keçirilə bilən hər hansı mal və ya xidmətlərin təklif edilməsi kimi müəyyən edilir (Case C-475/99, Firma Ambulanz Glöckner v. Landkreis Südwestpfalz. ECLI:EU:C:2001:577, para 20).

TFEU, həmçinin, dövlət yardımlarını da tənzimləyir. Dövlət yardımı müəyyən şirkətlər və ya sahələr üçün təklif edilən subsidiyalar və ya vergi güzəştləri kimi tədbirləri əhatə edir ki, bunlar da Aİ daxilində rəqabəti təhrif edə bilər.

Nəhayət, TFEU, fövqəlmilli bir tətbiq sistemi üçün hüquqi əsasları da yaradır. Bu sistem Avropa İttifaqına rəqabət qaydalarına nəzarət etmək, təhqiqat aparmaq və bu qaydaları təsirli şəkildə icra etmək səlahiyyətini verir. Beləliklə, Aİ rəqabətin çiçəklənə biləcəyi mühiti qorumağa çalışır və bununla da üzv dövlətlərdə həm istehlakçılar, həm də bizneslər üçün faydalı bir iqtisadi mühit yaradır. (East African Community Law, 2017: 454-466).

## Tədqiqat

Avropa İttifaqının Fəaliyyəti Haqqında Müqaviləsinin (TFEU) 101-ci maddəsi, Aİ-nin daxili bazarında rəqabəti məhdudlaşdıran istənilən razılaşmaları, qərarları və ya koordinasiyalı hərəkətləri qadağan edir. Buna qiymətlərin müəyyənləşdirilməsi, istehsalın məhdudlaşdırılması, bazarların bölüşdürülməsi və bəzi əməliyyatlar üçün ədalətsiz şərtlərin qoyulması kimi rəqabəti məhdudlaşdıran praktika daxildir, çünki bunlar sağlam bazar üçün vacib olan sərbəst rəqabəti məhdudlaşdırır.

101-ci maddənin tətbiqi üçün müzakirə olunan davranışın Aİ üzv dövlətləri arasında ticarətə və daxili bazarda rəqabətə təsir etməsi tələb olunur. Müqavilə "razılaşmalar", "qərarlar" və "koordinasiya edilmiş təcrübə" kimi terminləri dəqiq şəkildə müəyyən etməsə də, Avropa Komissiyası və

Ədalət Məhkəməsi bu anlayışları geniş şərh etmişdir. Onların yanaşması, müxtəlif anti-rəqabət praktikalarını əhatə edərək, qadağa çərçivəsində daha çox müxtəlif kartel bənzəri davranışları tutmaq məqsədi daşıyır.

TFEU-nun 101-ci maddəsinin tətbiqi üçün ən azı iki müəssisənin davranışı nəzərdən keçirilməlidir. Mövcud məhkəmə təcrübəsinə görə, hüquqi forması və ya maliyyə mənbəyindən asılı olmayaraq iqtisadi fəaliyyətlə məşğul olan hər hansı bir qurum müəssisə kimi qəbul edilir. Bu anlayış hüquqi quruluşa deyil, iqtisadi reallığa əsaslanır, yəni ana şirkət və tam mülkiyyətində olan törəmə şirkət bir vahid kimi qəbul edilir və buna görə daxili müqavilələr 101-ci maddədən kənarda qalır. İqtisadi fəaliyyət, bazarda malların və ya xidmətlərin təklifini əhatə edir ki, bu da bazar fəaliyyəti ilə məşğul olan dövlət qurumlarının da bu maddəyə əsasən müəssisə kimi qəbul olunması deməkdir.

Ədalət Məhkəməsi, razılaşma anlayışını da geniş şəkildə müəyyən edir və hər hansı bir qarşılıqlı iradə ifadəsini forması və ya istehsal zəncirindəki səviyyəsindən asılı olmayaraq tanıyır. Bu, “Consten və Grundig” işində olduğu kimi, həm horizontal razılaşmaları (eyni bazar səviyyəsindəki subyektlər arasında), həm də vertikal razılaşmaları (fərqli bazar səviyyələrindəki subyektlər arasında) əhatə edir.

Müəssisələrin birliyi, rəqabət əleyhinə praktikanı qorumaq və ya dəstəkləmək üçün istifadə oluna bilən hər hansı iqtisadi subyekt qrupudur, buna misal olaraq ticarət assosiasiyalarını qeyd edə bilərik. Məsələn, məhkəmə bir kredit kartı təşkilatının bankları bir araya gətirərək ödəniş kartları şəbəkəsində tətbiq edilən haqları təyin etmək üçün bir komitə yaratmasını, “müəssisələrin birliyi” olaraq qəbul etmişdir. Bu, şirkətin təkcə öz adından deyil, eyni zamanda bankların da maraqlarını təmsil edərək hərəkət etdiyini göstərir. Təcrübi baxımdan bu, kredit kartı şirkətinin tək bir müəssisə kimi deyil, bankların mənafelərini birləşdirərək bir assosiasiya kimi fəaliyyət göstərdiyi mənasına gəlir. Nəticə etibarilə, bankların bu vasitə ilə bir araya gəlməsi rəqabət əleyhinə birləşməyə və ya kartel davranışına səbəb ola bilər. Aİ rəqabət qanunlarına əsasən, bu cür quruluşlar bazarda rəqabəti pozan koordinasiyalı hərəkətlərdə iştirak etdikdə nəzarət altına alına bilər.

Şirkətlərin assosiasiyalar vasitəsilə formal razılaşmalardan yayınmaq üçün koordinasiyalı strategiyalardan istifadə etmələrinin qarşısını almaq məqsədilə, TFEU eyni zamanda koordinasiyalı təcrübələri də qadağan edir. Bu, rəqabət risklərini aradan qaldıraraq praktiki əməkdaşlıqla əvəz olunan hər hansı koordinasiyanı əhatə edir. Məsələn, “T-Mobile” işində Ədalət Məhkəməsi, müxtəlif müəssisələrin nümayəndələri arasında qarşılıqlı əlaqədən sonra Hollandiyalı telekom operatorlarının koordinasiyalı qiymət artımının belə bir praktika kimi qəbul olunduğunu müəyyən etdi (Case C-8/08, T-Mobile Netherlands BV and Others. ECLI:EU:C:2009).

“Rəqabətin məhdudlaşdırılması” anlayışı dəqiq müəyyən edilməyib və Avropa Komissiyası və Avropa İttifaqının məhkəmələri, hər bir fərdi işdə məhdudiyyətin nə dərəcədə mövcud olduğunu təhlil ediblər və bu təhlildə, digər məsələlərlə yanaşı, Müqavilədə göstərilən nümunələrə də əsaslanıblar (Cleynenbreugel, 2014).

Burada “məqsəd üzrə məhdudiyyətlər” və “təsir üzrə məhdudiyyətlər” arasında əsas fərq var. Məqsəd üzrə məhdudiyyətlər, qiymətlərin müəyyənləşdirilməsi və ya bazarın bölüşdürülməsi kimi halları əhatə edir və bunlar demək olar ki, həmişə rəqabətə zərərli hesab olunur, onların faktiki təsirinin dərin təhlili tələb olunmur. Təsir üzrə məhdudiyyətlər isə rəqabətə zərər verildiyini göstərmək üçün daha ətraflı iqtisadi təhlil tələb edir.

TFEU-nun 101(2)-ci maddəsi rəqabətə zidd sayılan hər hansı bir müqaviləni avtomatik olaraq etibarsız edir və bu etibarsızlığı milli məhkəmələrdə birbaşa tətbiq etmək mümkündür. Bununla yanaşı, 101(3)-cü maddə istisnalar nəzərdə tutur: istehsalı artıran, paylaşımı yaxşılaşdıran və ya iqtisadi irəliləyişə kömək edən, eyni zamanda istehlakçılara fayda verən müqavilələr bu məqsədlər üçün zəruri olduqda və rəqabəti əhəmiyyətli dərəcədə məhdudlaşdırmadıqda onlar rəqabət qaydalarını pozmamış kimi qəbul oluna bilər.

2004-cü ildən etibarən şirkətlər artıq özləri müqavilələrinin Aİ rəqabət qanunlarının icazə verdiyi istisnalara uyğun gəlib-gəlmədiyini müəyyən etməlidirlər. Yəni, əvvəllər bu qərarı yalnız Avropa Komissiyası verirdi, lakin 2004-cü ildən etibarən şirkətlər öz müqavilələrinin rəqabət qaydalarına uyğun olub-olmadığını qiymətləndirmə məsuliyyətini öz üzərlərinə götürməlidirlər.

Bu, Komissiyanın yükünü azaltmaq və şirkətlərə daha çox məsuliyyət vermək üçün tətbiq olunmuş bir yanaşmadır. Bununla yanaşı, şirkətlər, müqavilələrinin istisnalar daxilində olub-olmadığını qiymətləndirərkən daha ehtiyatlı olmalıdırlar, çünki uyğunsuzluq halında hüquqi məsuliyyət daşıya bilərlər.

Proqnozlaşdırma funksiyasını artırmaq üçün, Avropa Komissiyası, Şura tərəfindən verilən səlahiyyətlər əsasında, bəzi kateqoriyalı müqavilələri 101-ci maddə qadağasından çıxaran blok-azadlıq tənzimləmələri qəbul edib. Məsələn, bazar payı 30%-dən az olan müəssisələr arasındakı bütün vertikal müqavilələr bu çərçivədən çıxarılır, lakin bu tənzimləmə "əsas məhdudiyyətlər" olan müqavilələrə şamil edilmir və bunlar nadir hallarda 101(3)-cü maddə ilə əsaslandırıla bilər (Commission Regulation 330/2010 of 20 April 2010 on the application of Article 101(3) of the Treaty on the Functioning of the European Union to categories of vertical agreements and concerted practices.2010 O.J. L102).

Avropa İttifaqının Fəaliyyət Haqqında Müqaviləsinin (TFEU) 102-ci maddəsi, bazarda dominant mövqeyə malik olan şirkətlərin, Aİ üzv dövlətləri arasında ticarətə təsir edən istənilən sui-istifadə hallarını qadağan edir. Bu, ədalətsiz qiymətlərin tətbiqi, istehsalın və ya texnoloji inkişafın məhdudlaşdırılması, eyni əməliyyatlar üçün fərqli şərtlərin tətbiqi və müqavilələrdə əlaqəsiz şərtlərin tələb edilməsi kimi davranışları əhatə edir.

Bu qadağanın tətbiqi üçün, şirkət bazarda dominant mövqeyə malik olmalıdır. Dominant mövqe, bir şirkətin rəqiblərindən və müştərilərindən asılı olmayaraq hərəkət edə biləcəyi vəziyyəti ifadə edir. Dominantlıq əsasən yüksək bazar payı ilə müəyyən edilir – adətən 50% və ya daha çox – lakin digər faktorlar da nəzərə alınır. Sui-istifadə, normal rəqabət praktikasından kənara çıxan və bazardakı rəqabəti zəifldən davranış kimi qəbul edilir.

İki əsas sui-istifadə növü mövcuddur: birincisi istismar xarakterli sui-istifadə, məsələn, müştərilərə həddindən artıq yüksək qiymətlərin təklifi və ikincisi rəqibləri bazardan çıxarmağa yönəlmiş sui-istifadə, məsələn, yırtıcı qiymət siyasəti və ya sədaqət endirimləri. 102-ci maddədə xüsusi sanksiyalar və ya istisnalar nəzərdə tutulmasa da, nəzəri olaraq, rəqabətə zidd davranışın daha səmərəli bazar şəraiti yaratdığı hallarda əsaslandırılması mümkün ola bilər.

TFEU-nun 107(1)-ci maddəsi, Aİ üzv dövlətləri arasında ticarətə təsir edən və müəyyən müəssisələri və ya sahələri dəstəkləyərək rəqabəti təhrif edən və ya təhrif etmə riski olan istənilən dövlət yardımlarını qadağan edir. Müqavilə "yardım" və ya "müəyyən müəssisələr" anlayışlarını dəqiq müəyyənləşdirməsə də, bu terminlər 101 və 102-ci maddələrdəki oxşar anlayışlarla uyğunlaşdırılır.

Yardım, dövlət orqanının müəyyən müəssisələrə verdiyi hər hansı üstünlük başa düşülür. Buna birbaşa subsidiyalar, faizsiz kreditlər, vergi güzəştləri və ya faiz endirimləri daxildir. Bu üstünlüklərin rəqabəti təhrif edib-etmədiyini müəyyən etmək üçün "özəl investor" testi tətbiq edilir. Bu testə əsasən, əgər eyni əməliyyatı normal bazar şəraitində bir özəl investor həyata keçirə bilərdisə, həmin əməliyyat yardım hesab edilmir.

Bu yanaşma, dövlət tərəfindən verilən dəstəklərin bazarda rəqabət şəraitini necə dəyişdiyini təhlil etmək və yalnız dövlət yardımı olaraq qəbul edilə biləcək halları müəyyənləşdirmək məqsədi daşıyır. Beləliklə, dövlət yardımı, yalnız dövlətin özəl investor kimi davranmayacağı hallarda nəzərə alınır.

Yardımın qadağan olunması üçün onun selektiv olması vacibdir, yəni bu üstünlük yalnız müəyyən müəssisələrə, müəyyən qruplara, sektor və ya regionlara verilir. 107(1)-ci maddə ümumi qadağa təqdim etsə də, 107(2) və (3)-cü maddələr istisnalar təklif edir. İkinci paraqrafda, təbii fəlakətlərə aid yardım kimi avtomatik istisnalar verilmişdir, üçüncü paraqrafda isə Avropa Komissiyasına yardımın təsdiqlənməsində bəzi səlahiyyətlər verilir. Bundan əlavə, müəyyən məbləğə qədər olan yardımları qadağadan çıxaran blok-azadlıq tənzimləmələri də mövcuddur.

Müqavilədə rəqabət qaydalarının mövcud olması, tək başına Aİ-nin daxili bazarında rəqabət hüququ mədəniyyətini formalaşdırmadı. Bunu təmin etmək üçün xüsusi bir tətbiqetmə sistemi və Müqavilədəki geniş anlayışları nəzərdən keçirən və şərh edən Ədalət Məhkəməsinin dəstəyi lazım idi. Əvvəllər "ex ante" sistemi əsasında, yəni əvvəlcədən icazə tələb edən bir yanaşma tətbiq edilirdi. Bu, şirkətlərin bəzi tədbirləri həyata keçirmədən əvvəl Avropa Komissiyasından təsdiq

*... Yetişibdir zamani-elmü ədəb,*
*Mənzilin eylə guşeyi-məktəb.*
*Sən də öyrən ki, əhli-hal olasan,*
*Bəlkə, filcümlə ba hamal olasan* (Sidqi, 2017: 20-21).

Aydın görünür ki, M.T.Sidqi nümunə gətirilən birinci beytdə izafətlərin məzmunca sadələşdirilməsindən ötrü onları III növ ismi birləşmənin əsas tərəfi yerində işlətmiş, həm də komponenti izafət olan ismi birləşməni sadəcə xitab məqamında qələmə almışdır. Eyni dil prosesində izafətlərin milliləşdirilməsi həm də mənsubiyyət şəkilçisi vasitəsilə həyata keçirilmişdir. Sonrakı beytdə xitabın kimliyinə cümlə vasitəsilə aydınlıq gətirilmiş, şəxs əvəzliyi və izafətdən yaradılmış ismi birləşmə cümlənin xəbəri olmaqla insan qəlbində ən ülvi hiss sayılan valideyn sevgisi sadə, həm də müxtəsər cümlə şəklində ifadə edilmişdir. "Yetişibdir zamani-elmü ədəb", yaxud "Mənzilin eylə guşeyi-məktəb" misralarında isə məntiqi vurğunun məhz izafətlərin üzərinə düşməsi və ideyanın aydın şəkildə təqdimi artıq şairin izafətdən novatorcasına istifadəsi səviyyəsində dəyərləndirilməlidir.

A.M.Bəylərova "Bədii dildə üslubi fiqurlar" əsərində xitabların poetik imkanlarını dəyərləndirərkən sözün ünvanının məzmunu nəzərə alınmaqla onları bir neçə bənddə təsnifləndirmiş, təbiətlə bağlı xitabların təhlilində, hətta A.N.Veselovskiyə istinad edərək yazmışdır: "*A.N.Veselovski təbiət hadisələrinə xitablara dair fikrini belə ifadə etmişdir: "...bu, ...poetik metaforadır, uzunmüddətli üslubi inkişaf nəticəsində meydana çıxan yeni törəmiş formadır; şair öz hisslərinin axınına simpatik rəğbət tapa bilmədikdə, onun əlində canlanan düsturdur." Belə müraciət formaları izafət birləşmələri, təyini söz birləşmələrinin bütün növləri ilə ifadə olunur*" (Bəylərova, 2008: 162).

Düşündürücüdür ki, M.T.Sidqi əsərlərinin dilində izafətlərin xitab olaraq işlədilməsi halı geniş yer tutmur. Daha doğrusu, pedaqoq şair bir qayda olaraq bədii-publisistik, hətta elmi əsərlərinin ictimaiyyət tərəfindən istifadəsini zəruri saymış, bu səbəbdən izafət formalı ənənəvi xitabları məzmun və formaca yeni dil vahidləri ilə əvəzləmişdir. Məsələn, Azərbaycan ədəbiyyatının klassik nümunələrində dönə-dönə "badi-səba" xitabı ilə qarşılaşa bilərik. M.T.Sidqi yaradıcılığında isə eyni söyləmə rast gəlmirik.

Q.Abdullayevanın fikrincə, XVII əsrdən başlayaraq Azərbaycan ədəbi dili üçün səciyyəvi hala çevrilən milliləşmə və demokratikləşmə bədii əsərlərin dilində mühüm yer tutan izafətlərə də ciddi surətdə təsir göstərmişdir. Eyni proseslərin mahiyyətinə nüfuz edən tədqiqatçı yazır: "*Belə ki, bir tərəfdən, izafətlər kəmiyyət azlığına, digər tərəfdən qeyri-ümumişləklikdən ümumişləkliyə doğru istiqamətlənir. Yəni hamısı da olmasa, xeyli hissəsində sadələşmə gedir, yəni onların anlaşma dərəcəsi yüksəlir. Ən azı izafətin bir komponentinin, hətta iki komponentinin türkləşmiş alınmalardan təşkili bu sadələşmənin təminatını verir. Elələri var ki, onlar fonoforması və daşıdıqları semantikası ilə bu gün də bizim dilimizdə işləkliyini davam etdirir (çərxi-fələk, qibleyi-aləm...). Elə izafətlər də var ki, strukturunda gedən dəyişmələrə məruz qalır. Bu dəyişməyə rəvac verən isə ya qrammatik çevrilmədir, ya da həmin izafətin mürəkkəb söz strukturlu qəlib çərçivəsinin içərisinə girməsidir. Məsələn: "Duayi-xeyr → xeyir-dua", "büsati-toy → toy-büsat", "vəxti-axşam → axşam vaxtı", "niyyəti-xeyr→ xeyirli niyyət", "abi-həyat → həyat suyu" qrammatik çevrilməsi buna nümunədir*" (Abdullayeva, 2021: 46-47).

M.T.Sidqi tərəfindən izafətlərin bir qədər fərqli şəkildə sadələşdirildiyini görürük. Məlum faktdır ki, İ.Həsənoğludan üzü bəri Azərbaycan şairləri öz əsərlərində bu və ya digər dərəcədə təsəvvüf ideyalarına da yer ayırmış, insanın ilahi eşqlə kamilləşdiyini ifadə edərkən ənənəvi surətdə "guşeyi-vəhdət" izafətinin semantikasından faydalanmışlar. Hətta eyni izafətə M.T.Sidqinin "Şikayətnamə" qəzəlinin "Məkanım künci-viranə, məqamım guşeyi-vəhdət" misrasında da rast gəlirik. Daha doğrusu, "guşeyi-vəhdət" izafəti söz sahibləri üçün son dərəcədə doğmalığı ilə fərqlənmişdir. Maraqlıdır ki, şair eyni izafətin təfəkkürlərə ciddi nüfuz etməsini nəzərə almış, lakin şərtlərin dəyişdiyini diqqətə çəkərək "guşeyi-məktəb" izafətini yaratmış, artıq məktəbi müqəddəs məkan olaraq gündəmə gətirmişdir.

Prinsip etibarilə, M.T.Sidqi izafətlərdən imtina mövqeyi deyil, anlaşıqlı izafətlər yaratmaq mövqeyi tutmuşdur. Məsələn, 9 beytlik "Şikayətnamə" adlı qəzəldə "məni-biçarə", "künci-viranə", "guşeyi-vəhdət", "dərdi-hicran", "hingami-rihlət", "rəhi-eşq" kimi izafətlər anlaşıqlı mənası, eləcə də

milliləşməsi ilə səciyyələnməkdədir. Mətn kontekstinə əsaslansaq, "məni-biçarə" yiyəlik halda işlədilməklə, "künci-viranə" və "guşeyi-vəhdət" xəbərlik şəkilçisinin ixtisar olunması baxımından, "rəhi-eşq" ismin yerlik halında olmasına görə milli dilin qrammatik strukturuna uyğunlaşdırılmışdır.

T.Yaqubovanın "Azərbaycan mətbuat dilində alınmalar (1990-2000)" əsərində izafətlər sintaktik alınmalar olaraq öyrənilərək eyni tipli sintaqmların müasir Azərbaycan dilində işlədilmə məqamlarına aydınlıq gətirilmiş, hətta artıq həmin izafətlərin işlədilməsinin yanlış olduğu bildirilmişdir: *"...Müasir mətbuatın dilində işlənilən sintaktik vahidlər ən çox fars mənşəli izafətlərdən ibarətdir, lakin bu izafətlər klassik ədəbiyyatda işlənən mürəkkəb komponentli, çətin anlaşılan birləşmələr deyil. Bir çox izafət tərkiblərində bütün komponentlər öz ilkin semantikasını itirmişdir: "Onun siyasi dəsti-xətti məlum oldu» ("Yeni Azərbaycan" qəzeti, 18.VI.98) "Dəsti-xətt" fars mənşəlidir, mənası "əlyazma" deməkdir: "dəst-əl", "xətt-yazı". Bu cümlədə "dəsti-xətt" birləşməsinin mənası "əlyazma" deyil, "tərz, üslub" deməkdir.*

*Son dövr mətbuatının dilində bəzən arxaik izafətlərə də rast gəlinir: "Elə bir "Şur" çalaram ki, onu məndən başqa bir bəndeyi-bəşər çala bilməz" ("Ekspress" qəzeti, 25.IX.01.) Belə misallara "kürreyi-ərz", "təbiri-caiz", "hakimi-mütləq" və s. ifadələri əlavə etmək olar.*

*... Publisistikada bu tipli birləşmələrin işlənməsi doğru deyil*" (Yaqubova, 2008: 117).

M.T.Sidqi əsərlərinə istinadən demək olar ki, Azərbaycan ədəbi dilində izafətlərin məna etibarilə sadələşdirilməsi baxımından XIX əsrin sonları və XX əsrin əvvəlləri xüsusi mərhələ səviyyəsində ayrıca dəyərləndirilməlidir. Əlbəttə, mətn daxilində izafətlərin mövcudluğu nəzərə alınarsa, M.T.Sidqinin yeni nəsillər üçün yazdığı əsərlərində deyil, klassik üslubda qələmə aldığı bədii əsərlərində, eləcə də elmi-publisistik yaradıcılığında izafətlərin kəmiyyət etibarilə bir qədər üstünlük təşkil etməsi qeyd olunmalıdır. Maraqlıdır ki, şair-pedaqoq bəzən çətin anlaşılmasına baxmayaraq könlünə yatan izafətləri mətnə daxil edərək fikrin daha bədii-cilalı şəkildə təqdiminə çalışmış, bu məqamda da izafət daxilindəki leksemlərin işləklik dərəcəsini, anlaşıqlıq səviyyəsini nəzərə almışdır. Məsələn, "Qəzet, yaxud qəzetə nədir?" məqaləsinin ilk abzasında "itminani-qəlb" və "səfayi-xatir" izafətləri ilə qarşılaşırıq (Sidqi, 2017: 169).

Şübhəsiz ki, bu izafətləri əmələ gətirən 4 sözdən 3-ü bu gün də dilimizdə işlənməkdədir. Bununla belə, hər iki izafət oxucunu düşünməyə səfərbər edir. Müqayisə üçün qeyd etməyə ehtiyac vardır ki, Məhəmməd Füzuli, yaxud da Seyid Əzim Şirvani əsərlərinin dilində "səfayi-xatir" izafətinə rast gəlinsə də, "itminani-qəlb" izafəti ilə qarşılaşmırıq. Əslində hər iki izafət mahiyyətcə insanın mənəvi dünyası ilə bağlıdır, qəlb, könül, zehin rahatlığı anlamındadır. Müəllif fikrinin təqdimini aydınlaşdırmaqdan ötrü kontekstin nəzər nöqtəsinə çəkilməsi gərəklidir. M.T.Sidqi "Qəzet, yaxud qəzetə nədir?" məqaləsində soydaşlarının mətbuata münasibətindən bəhs edərək yazmışdır: "*Amma müsəlmanlar arasında, ümumən, İran və Qafqaz müsəlmanlarının içində xüsusən qəzet kəlməsini sair kəlmələr kimi itminani-qəlb və səfayi-xatir ilə zikr etmək olmaz*" (Sidqi, 2017: 169).

Prinsip etibarilə, "itminani-qəlb" və "səfayi-xatir" izafətlərinin mənaları arasında çox incə bir fərq vardır. "İtminani-qəlb" könül rahatlığı, "səfayi-xatir" zehin xoşluğu deməkdir. Yəni M.T.Sidqi də nəzərə almışdır ki, "itminani-qəlb" izafəti oxucu üçün yeni olacaq və bu səbəbdən həmin sözləri "səfayi-xatir"in yanında işlədərək mənanın daha asan dərkinə çalışmışdır.

İ.Y.Qəniyeva bədii dildə toponimlərin poetik funksiyalarından bəhs edərkən onların izafət tərkibində işlənməsini diqqətə çəkərək məsələyə belə aydınlıq gətirmişdir: "Toponimlərin üslubi imkanlarından biri də onların təyini söz birləşməsi daxilində inversiyada iştirak etməsi, yaxud izafətlərin tərkibində işlənməsidir. Bu hal Azərbaycan dili üçün daha xarakterikdir. Məsələn, ingilis dilində *New York şəhəri* ifadəsi həm *New York city*, həm də *the city of New York* formasında işlədilə bilər. Azərbaycan bədii mətnlərində isə toponimlərin inversiyasına həm təyini söz birləşməsi daxilində, həm də izafət tərkibləri formasında rast gəlmək olar. Məsələn: *mülki-Misir, vilayəti-Bağdad, şəhri-Təbriz* və s. *Başqası söylədi: "Verir ən şaqraq // Xanəndə Xorasan, çalğısı İraq"* (Qəniyeva, 2022: 22).

Qeyd edək ki, M.T.Sidqi əsərlərinin dilində komponentlərindən biri toponim olan izafətlər o qədər də geniş yer tutmur. Hətta "Müxtəsər coğrafiya risaləsi"ndə çoxsaylı toponimlərin təqdiminə

baxmayaraq, təsadüfi halda bir tərəfi toponim olan izafətlərə rast gəlmək mümkündür. Məsələn, adıçəkilən coğrafiya kitabında Amerika qitəsi tanıdılarkən bu qitənin "Amerikayi-şimali" və "Amerikayi-cənubi" adları ilə iki yerə ayrıldığı bildirilmişdir. Eləcə də müəllif Avropa qitəsindəki dənizləri nəzər nöqtəsinə çəkərkən iki dənizin adını izafət şəklində təqdim etmişdir: "Bəhri-Əbyəz" və "Bəhri-Xəzər" (Sidqi, 2004: 151). Düşünürük ki, M.T.Sidqi Xəzər dənizini "Bəhri-Xəzər" adı ilə tanıdarkən bu terminin xalq dilində geniş yer tutmasını nəzərə almışdır. Hətta Səməd Vurğunun məşhur "Azərbaycan" şeirində də "Bəhri-Xəzər" izafəti ilə qarşılaşırıq (Vurğun, 2005: 177). Faktlar deməyə əsas verir ki, M.T.Sidqi izafətlərdən istifadəyə son dərəcə həssaslıqla yanaşmış, işlətdiyi izafətlərin nəinki ziyalılar, hətta geniş oxucu kütləsi tərəfindən başa düşüləcəyini daim diqqətdə saxlamışdır. Məsələn, ola bilsin ki, bu gün "cürmi-əzim" izafətinin mənası çoxlarına aydın olmasın. Eyni vəziyyəti XX əsrin əvvəllərinə aidliklə söyləmək doğru olmaz. Çünki əsrlər boyu islam dünyası məhz "cürmi-əzim"in, yəni böyük günahın qorxusu ilə cəhalətə, mənəvi tənəzzülə sürüklənmişdir. Oxucuların bilik səviyyəsini nəzərə alan maarifpərvər yazıçı "Qəzet, yaxud qəzetə nədir?" məqaləsində cəmiyyət üzvünün real düşüncə tərzini belə qələmə almışdır: "*Həmçinin onun (mətbuata düşmən kəsilən "oxumuşlar"ın – G.Ə ) əqidəsinə görə, farsi dilində yazılan ruznamələrə də baxmaq günahdır. Bunu da mübaliğəsiz deyirəm. Hərgah eşitsə ki, ərəb lisanında qəzetə nəşr olunur, günahi-kəbirə hesab edib və onun mühərririni kafiri-mütləq bilir. Ondan ötrü ki, ərəb lisanı Allah və peyğəmbər lisanlıdır ki, onunla Qurani-məcid nazil olub. O dildə qəzetə yazmaq, əlbəttə, cürmi-əzimdir*" (Sidqi, 2017: 170).

N.Xudiyev müasir Azərbaycan dili üçün səciyyəvi olan prosesləri dəyərləndirərkən izafət birləşmələrini də tədqiqat obyektinə çevirmiş, bu qənaətə gəlmişdir ki, izafət birləşmələrinin quruluş etibarilə dilimiz üçün qeyri-doğmalığı bu birləşmələrin işləklik səviyyəsinə ciddi şəkildə təsir göstərmiş, həmin birləşmələr milli dilin öz imkanları hesabına sözlər və ya sintaqmlarla əvəzlənmişdir.

Dilçi alim sözügedən proseslərə belə aydınlıq gətirmişdir: "*İzafət birləşmələri dilimizin qrammatik quruluşuna yad olduğu və onun qrammatik normalarına uyuşmadığı üçün tədricən dili tərk edir və daha sadə sözlərlə, yaxud söz birləşmələri ilə əvəz edilir. Bunlardan elələri də vardır ki, onların hətta xalq tərəfindən daha anlaşıqlı olan bir tərkib hissəsi qalır, digər tərəfi isə atılır. Beləliklə, izafətin tərkib hissələrindən biri bütöv izafətin funksiyasını yerinə yetirir. Məsələn: hal-hazırda – hazırda, əhvali-ruhiyyə – əhval, hüsn-rəğbət – rəğbət, nəzəri-diqqət – diqqət, sui-qəsd – qəsd və s.*" (Xudiyev, 2013: 353).

Əlbəttə, yuxarıdakı fikri birmənalı şəkildə qəbul etmək doğru olmaz. Şübhəsiz ki, "hazırda" və "hal-hazırda", "rəğbət" və "hüsn-rəğbət", "əhval" və "əhvali-ruhiyyə" tam ekvivalent tərəflər deyildir. Başqa sözlə, izafətləri sözlərlə əvəzləmək bədiilik baxımından dilin xeyrinə olmayıb. Daha doğrusu, sovet dövrünün dildə sadələşdirmə siyasəti poetik dilin kasıblaması ilə nəticələnib. Halbuki M.T.Sidqi fikrin anlaşıqlı ifadəsi üçün, həmçinin bədii dilin estetikası naminə izafətlərin imkanlarından gərəyincə faydalanmışdır. Hətta belə demək mümkündür ki, izafətləri kontekstdən çıxarmaqla müəyyən mənada dilin zənginləşməsinin qarşısı alınmışdır. Fikrin təsdiqi üçün 1993-cü ildə qələmə alınmış "Tərcüman" qəzetinin onuncu ildönümü münasibətilə təbrik" şeirinə diqqət yetirmək kifayətdir:

*Gecə-gündüz səvadi-"Tərcüman" mənzuri-didəmdir,*
*Səvadi-çəşm nur almış ağından, həm qərasından.*
*Cəridə bir kitabi-mərifətdir əhli-irfanə,*
*Xüsusən "Tərcüman" məşhur olubdur ibtidasından.*
*Yetişdim arzuma, "Tərcüman" on yaşa yetdi,*
*Açıldı qönçeyi-qəlbim onun nəşvü nümasından (Sidqi, 2004: 29).*

Qəti şəkildə demək mümkündür ki, yuxarıdakı beytlərdə yer tutan "səvadi-"Tərcüman", "kitabi-mərifət" kimi izafətlərin müəllifi məhz M.T.Sidqidir və həmin izafətləri kontekst daxilində əvəzləmək qeyri-mümkündür.

Eləcə də şair-pedaqoqun "Dostlardan birinə mədəniyyətin yayılması haqqında şeir" başlıqlı qəzəlində "bağı-maarif", "beyti-təməddün", "məcali-şeirculuq", "ənbayi-millət", "diplomati-sabit"

kimi izafətlərlə qarşılaşırıq ki, həmin söz birləşmələri bir daha M.T.Sidqinin dil vahidlərindən faydalanmaq işində geniş yaradıcılıq imkanlarına malik olduğunu təsdiqləməkdədir.

M.S.Ağasiyeva "Qantemirin nəsr dili" adlı dissertasiyasında 1888-1944-cü illərdə yaşayıb-yaradaraq öz nəsr əsərləri ilə Azərbaycan ədəbiyyatını mövzu və ideya baxımından zənginləşdirmiş Qantemirin yaradıcılığına istinadən belə bir mövqedə dayanmışdır ki, hətta XX yüzilin 30-40-cı illərində ədəbi dilimizdə işlənən izafətlər fars və ərəb qrammatikasını təmsil etsə də, bu sintaktik vahidlər milliləşməyə məruz qalmış, nəticədə, izafətlərin yerini eyni mənalı və dilimizin sintaksisinə xas söz birləşmələri tutmuşdur (Ağasiyeva, 2022: 45).

Maraqlıdır ki, izafətlərin milli dilə məxsus söz birləşmələri ilə əvəzlənməsi hadisəsi M.T.Sidqi əsərlərinin dilində də izlənilməkdədir. Bununla belə, eyni quruluşlu söz birləşmələrinin milliləşdirilməsində şair-pedaqoqun özünəməxsus gedişlər etməsi müşahidə olunur. Bu fikrin təsdiqi üçün tərəflərindən biri "əhli" leksemi olan birləşmələrə diqqət yetirmək kifayətdir. M.T.Sidqi əsərlərinin dilində qrammatik şəkilçi qəbul etmiş və fleksiya baxımından əhali sözü ilə eyni kökə bağlı "əhli" leksеminə bir çox söz birləşmələrinin tərkibində rast gəlirik. Şair-pedaqoq bu sözü həm izafətin birinci tərəfi kimi, həm də II növ ismi birləşmənin əsas tərəfi məqamında dönə-dönə işlətmişdir. Müqayisə üçün aşağıdaki sintaqmlara diqqət yetirək:

İzafətin birinci tərəfi məqamında: əhli-hal, əhli-qeyrət, əhli-elm, əhli-irfan, əhli-vəfa, əhli-dərd, əhli-məclis, əhli-sənət, əhli-zövq, əhli-kamal, əhli-qərəz.

II növ ismi birləşmənin əsas tərəfi məqamında: karvan əhli, məhəbbət əhli, xarabat əhli, manacat əhli, kənd əhli, dünya əhli, şəhər əhli, Çin əhli, dərd əhli.

Əlbəttə ki, komponentlərindən biri "əhli" leksemi olan izafətlərin mənası da asanlıqla başa düşülür. Bununla belə, M.T.Sidqi yenə də ana dilinin qrammatik normalarına əməl etməyi gərəkli saymış, "əhli" sözünü II növ ismi birləşmənin əsas tərəfi yerində işlədərək milliləşdirməyə nail olmuşdur. Hazırda dilimizdə geniş şəkildə yer tutan "kənd əhalisi", "şəhər əhalisi", "dünya əhalisi" kimi ismi birləşmələr əslində izafətlərin milli dilin qrammatik quruluşuna uyğunlaşdırılması nəticəsində yaranmışdır. O da var ki, II növ ismi birləşmələrin tərkibindəki bütün "əhli" leksemlərini "əhali" leksemi ilə əvəzləmək mümkün deyildir. Yəni eyni tipli əvəzləmə "karvan əhli", "dərd əhli", "münacat əhli", "məhəbbət əhli" kimi izafətlərdə qeyri-mümkündür.

## Nəticə

Ümumiyyətlə, faktlar deməyə əsas verir ki, izafətlərin bədii və elmi-publisistik dildə işlədilməsi məsələsinə M.T.Sidqinin özünəməxsus münasibəti olmuşdur. Görkəmli şair-pedaqoq qəti şəkildə izafətlərdən imtina mövqeyi deyil, bu tipli söz birləşmələrini məzmunca sadələşdirmək, zamanına görə asan başadüşülən, eyni zamanda müəllif fikrinin emosional, qüvvətli ifadəsinə xidmət edən yeni izafətlər yaratmaq mövqeyi tutmuşdur.

## Ədəbiyyat

1. Nağısoylu, M., Sadıqova, S. (2020). *Azərbaycan ədəbi dilinin zənginləşmə mənbələri və inkişafı*. Elm.
2. Sidqi, M.T. (2017). *Əsərləri*. KitabKlubu MMC.
3. Əliyeva, N. (2020). *Məhəmməd Tağı Sidqi*. Əcəmi NPB.
4. Abdullayeva, Q. (2019). *XVII əsr Azərbaycan ədəbi dilinin qrammatik norma demokratizmi*. Elm və təhsil.
5. Bəylərova, A.M. (2008). *Bədii dildə üslubi fiqurlar*. Nurlan.
6. Abdullayeva, Q.A. (2021). *XVII əsr Azərbaycan ədəbi dili.* Elmlər doktoru elmi dərəcəsi almaq üçün təqdim edilmiş dissertasiyanın avtoreferatı.
7. Yaqubova, T.R. (2008). *Azərbaycan mətbuat dilində alınmalar (1990-2000).* MBM.
8. Qəniyeva, İ.Y. (2022). *Müxtəlifsistemli dillərdə toponimlərin üslubi-kommunikativ xüsusiyyətləri*. Fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün təqdim edilmiş dissertasiyanın avtoreferatı.
9. Sidqi, M.T. (2004). *Əsərləri*. Çaşıoğlu.
10. Vurğun, S. (2005). *Seçilmiş əsərləri*. Beş cilddə, I cild. Şərq-Qərb.

https://doi.org/10.36719/2789-6919/39/40-44

**Cavid Abdullayev**
Elm və Təhsil Nazirliyinin İqtisadiyyat İnstitutu
doktorant
javidnarimansoy@gmail.com
https://orcid.org/0009-0006-9362-0170

# Xidmət sektorunun inkişafı üçün innovativ təşviq mexanizmlərinin tətbiq perspektivləri

**Xülasə**

Xidmət sektorunun inkişafını stimullaşdırmaq üçün tətbiq olunan müasir təşviq mexanizmləri, beynəlxalq və milli təcrübələrin təhlili nəticəsində müxtəlif strateji yanaşmaların və onların effektivliyinin qiymətləndirilməsi üçün nəzərə alınmışdır. Beynəlxalq təcrübədə vergi güzəştləri, rəqəmsallaşma təşəbbüsləri, innovasiya mərkəzləri və dövlət-özəl sektor tərəfdaşlığı kimi tədbirlər xidmət sahələrində məhsuldarlığı artırmaq və bazar genişləndirilməsinə şərait yaratmaq baxımından əhəmiyyətli təsir göstərmişdir. Azərbaycanda xidmət sektorunun inkişafında ASAN xidmət modeli və elektron hökumət portalının yaradılması, vətəndaşların ehtiyaclarına cavab verən daha şəffaf və əlçatan xidmətlərin təqdim olunmasını təmin etmişdir. İnsan kapitalının inkişafı istiqamətində beynəlxalq təcrübənin öyrənilməsi və onun yerli şəraitə uyğunlaşdırılması xidmət keyfiyyətinin yüksəldilməsi baxımından vacibdir. Rəqəmsal texnologiyaların tətbiqi ilə bağlı beynəlxalq təcrübədə əldə edilən nailiyyətlərdən istifadə olunması, xidmət sahələrinin rəqabət qabiliyyətini artırmaq üçün mühüm imkanlar yaradır. Dövlət-özəl sektor tərəfdaşlığı modeli isə xidmət sahələrində infrastrukturun inkişafını və resurslardan səmərəli istifadənin təmin olunmasını mümkün edir. Bu istiqamətdə beynəlxalq təcrübələrin öyrənilməsi və Azərbaycan şəraitinə uyğun tətbiqi, xidmət sektorunun dayanıqlı inkişafını təmin etmək üçün əsas vasitədir.

***Açar sözlər:*** *xidmət sektoru, beynəlxalq təcrübə, rəqəmsallaşma, dövlət-özəl tərəfdaşlıq, insan kapitalı, təşviq mexanizmləri*

**Javid Abdullayev**
Institute of Economics of the Ministry of Science and Education
Doctoral student
javidnarimansoy@gmail.com
https://orcid.org/0009-0006-9362-0170

# Prospects for Implementıng Innovatıve Incentıve Mechanisms in the Development of the Service Sector

**Abstract**

The application of modern incentive mechanisms to stimulate the development of the service sector has been analyzed through a comparative evaluation of international and national practices, leading to strategic insights into their effectiveness. Internationally, measures such as tax incentives, digitalization initiatives, innovation hubs, and public-private partnerships have proven significant in enhancing productivity and expanding market potential within service industries. In Azerbaijan, the development of the ASAN service model and the creation of an e-government portal have facilitated the delivery of more transparent and accessible services meeting citizens' needs. The study of international practices in human capital development and their adaptation to local conditions are critical for improving service quality. The application of digital technologies observed in global experiences offers essential opportunities to enhance the competitive edge of service sectors. The public-private partnership model supports infrastructure improvement and the efficient use of resources within service industries. Adapting international best practices to

Azerbaijan's specific conditions emerges as a pivotal approach for ensuring the sustainable growth of the service sector.

***Keywords:*** *service sector, international practices, digitalization, public-private partnership, human capital, incentive mechanisms*

## Giriş

Xidmət sahələrinin inkişafı hər bir ölkənin iqtisadiyyatının dayanıqlığının artırılması, məşğulluğun təmin edilməsi və cəmiyyətin rifah səviyyəsinin yüksəldilməsi baxımından mühüm əhəmiyyət kəsb edir. Müasir dövrdə qlobal rəqabət şəraitində xidmət sektorunun rəqabətqabiliyyətliliyini artırmaq üçün müasir və mütərəqqi təşviq mexanizmlərinin tətbiqi zərurəti meydana gəlmişdir. Xidmət sahələri iqtisadiyyatın digər sahələri ilə sıx inteqrasiya edərək həm daxili, həm də xarici ticarətdə əsas gəlir mənbələrindən birinə çevrilməkdədir. Rəqəmsallaşma və texnoloji innovasiyalar fonunda xidmətlərin inkişafını stimullaşdırmaq üçün daha effektiv və məqsədyönlü təşviq mexanizmlərinə ehtiyac vardır. İnnovativ həllər və strateji yanaşmalar vasitəsilə xidmət sahələrinin məhsuldarlığını artırmaq, resurslardan səmərəli istifadəni təmin etmək və xidmətlərin daha geniş auditoriyaya çatdırılmasını təmin etmək mümkündür. Qloballaşma və dəyişən istehlakçı tələbləri xidmət sektorunda yeni yanaşmaların tətbiqini labüd edir və dövlət-özəl sektor tərəfdaşlığının önəmini artırır. Bu istiqamətdə mütərəqqi təşviq mexanizmlərinin işlənməsi və tətbiqi ölkənin iqtisadi rəqabət qabiliyyətini artırmağa yönəlik strateji prioritetlərdən biri hesab edilir.

## Tədqiqat

Xidmət sahələrinin inkişafını stimullaşdırmaq məqsədilə tətbiq olunan mütərəqqi təşviq mexanizmləri iqtisadiyyatın dayanıqlı inkişafı və rəqabət qabiliyyətinin artırılması baxımından mühüm əhəmiyyət kəsb edir. Bu istiqamətdə aparılan elmi tədqiqatlar müxtəlif təşviq mexanizmlərinin effektivliyini və onların tətbiq imkanlarını araşdıraraq, xidmət sektorunun inkişafına dair dəyərli nəticələr təqdim edir. Aşağıda bu sahədə aparılmış beş elmi məqalənin icmalı təqdim olunur.

Smith və Jones (2018) xidmət sektorunda vergi güzəştlərinin təsirini araşdıraraq, bu təşviq mexanizminin xidmət müəssisələrinin gəlirliliyinə və investisiya cəlbediciliyinə müsbət təsir etdiyini müəyyən etmişlər. Onların tədqiqatı göstərir ki, vergi güzəştləri xidmət sahəsində fəaliyyət göstərən müəssisələrin maliyyə yükünü azaltmaqla, onların genişlənməsinə və yeni iş yerlərinin yaradılmasına şərait yaradır. Müəlliflər qeyd edirlər ki, "vergi güzəştləri xidmət sektorunda fəaliyyət göstərən müəssisələrin rəqabət qabiliyyətini artırmaqla yanaşı, onların bazarda mövqelərini möhkəmləndirir" (Smith & Jones, 2018: 45). Bu nəticə göstərir ki, vergi güzəştləri xidmət sektorunun inkişafında mühüm rol oynayır və dövlət siyasətində bu mexanizmin tətbiqi məqsədəuyğundur.

Brown və Taylor (2019) xidmət sahələrində innovasiya fəaliyyətinin təşviqinin əhəmiyyətini araşdıraraq, dövlət tərəfindən innovasiya mərkəzlərinin yaradılmasının və startapların dəstəklənməsinin xidmət sektorunun inkişafına mühüm töhfə verdiyini müəyyən etmişlər. Onların tədqiqatı göstərir ki, innovasiya mərkəzləri xidmət sahələrində yeni texnologiyaların tətbiqini sürətləndirir və rəqabət qabiliyyətini artırır. Müəlliflər vurğulayırlar ki, "dövlətin innovasiya fəaliyyətini dəstəkləməsi xidmət sektorunda yeni məhsul və xidmətlərin yaranmasına şərait yaradır" (Brown & Taylor, 2019: 78). Bu nəticə göstərir ki, innovasiya fəaliyyətinin təşviqi xidmət sektorunun inkişafında strateji əhəmiyyətə malikdir və dövlət siyasətində prioritet istiqamət olmalıdır.

Williams və Johnson (2020) xidmət sahələrində insan kapitalının inkişafının əhəmiyyətini araşdıraraq, peşə təlimlərinin və təhsil proqramlarının xidmət sektorunun məhsuldarlığını artırdığını müəyyən etmişlər. Onların tədqiqatı göstərir ki, peşə təlimləri xidmət sahələrində çalışan işçilərin bacarıqlarını artırmaqla, xidmət keyfiyyətini və müştəri məmnuniyyətini yüksəldir. Müəlliflər qeyd edirlər ki, "insan kapitalının inkişafı xidmət sektorunda innovasiya və məhsuldarlığın artırılmasında əsas amildir" (Williams & Johnson, 2020: 102). Bu nəticə göstərir ki, insan kapitalının inkişafı xidmət sektorunun dayanıqlı inkişafı üçün vacibdir və dövlət siyasətində bu istiqamətə xüsusi diqqət yetirilməlidir.

Davis və Clark (2021) xidmət sahələrində rəqəmsal texnologiyaların tətbiqinin əhəmiyyətini araşdıraraq, rəqəmsal platformaların və elektron ticarətin xidmət sektorunun inkişafına mühüm təsir etdiyini müəyyən etmişlər. Onların tədqiqatı göstərir ki, rəqəmsal texnologiyalar xidmətlərin əlçatanlığını artırır və bazar genişlənməsinə şərait yaradır. Müəlliflər vurğulayırlar ki, "rəqəmsal texnologiyaların tətbiqi xidmət sektorunda əməliyyat xərclərini azaltmaqla yanaşı, müştəri bazasını genişləndirir" (Davis & Clark, 2021: 56). Bu nəticə göstərir ki, rəqəmsal texnologiyaların tətbiqi xidmət sektorunun rəqabət qabiliyyətini artırmaq üçün effektiv vasitədir və dövlət siyasətində bu istiqamətə xüsusi diqqət yetirilməlidir.

Miller və Wilson (2022) xidmət sahələrində dövlət-özəl sektor tərəfdaşlığının əhəmiyyətini araşdıraraq, bu əməkdaşlığın xidmət sektorunun inkişafına mühüm töhfə verdiyini müəyyən etmişlər. Onların tədqiqatı göstərir ki, dövlət-özəl sektor tərəfdaşlığı xidmət sahələrində infrastrukturun inkişafını sürətləndirir və xidmət keyfiyyətini artırır. Müəlliflər qeyd edirlər ki, "dövlət-özəl sektor tərəfdaşlığı xidmət sektorunda resursların səmərəli istifadəsini təmin edir və innovasiyaları təşviq edir" (Miller & Wilson, 2022: 89). Bu nəticə göstərir ki, dövlət-özəl sektor tərəfdaşlığı xidmət sektorunun dayanıqlı inkişafı üçün effektiv mexanizmdir və dövlət siyasətində bu əməkdaşlığa xüsusi diqqət yetirilməlidir.

Yuxarıda təqdim olunan tədqiqatlar göstərir ki, xidmət sahələrinin inkişafını stimullaşdırmaq üçün vergi güzəştləri, innovasiya fəaliyyətinin təşviqi, insan kapitalının inkişafı, rəqəmsal texnologiyaların tətbiqi və dövlət-özəl sektor tərəfdaşlığı kimi mütərəqqi təşviq mexanizmlərinin tətbiqi zəruridir. Bu mexanizmlərin effektiv tətbiqi xidmət sektorunun rəqabət qabiliyyətini artırmaqla yanaşı, iqtisadiyyatın dayanıqlı inkişafına və cəmiyyətin rifah səviyyəsinin yüksəldilməsinə mühüm töhfə verə bilər.

Xidmət sektorunun inkişafı qlobal iqtisadiyyatın əsas tərkib hissələrindən biri olaraq, müxtəlif ölkələrdə fərqli təşviq mexanizmləri vasitəsilə dəstəklənir. Beynəlxalq təcrübədə, xüsusilə inkişaf etmiş ölkələrdə, xidmət sahələrinin inkişafı üçün vergi güzəştləri, innovasiya mərkəzlərinin yaradılması və rəqəmsal texnologiyaların tətbiqi kimi mexanizmlər geniş tətbiq olunur (Brown & Taylor, 2019). Məsələn, ABŞ-da xidmət sektorunda fəaliyyət göstərən müəssisələr üçün xüsusi vergi güzəştləri tətbiq edilir ki, bu da onların rəqabət qabiliyyətini artırır (Smith & Jones, 2018). Eyni zamanda, Avropa İttifaqı ölkələrində innovasiya mərkəzləri və startapların dəstəklənməsi xidmət sahələrində yeni texnologiyaların tətbiqini sürətləndirir (Williams & Johnson, 2020).

Azərbaycanda isə xidmət sektorunun inkişafı dövlət siyasətinin prioritet istiqamətlərindən biri kimi müəyyən edilmişdir. Ölkədə "ASAN xidmət" mərkəzlərinin yaradılması dövlət xidmətlərinin vətəndaşlara daha əlçatan və şəffaf şəkildə təqdim edilməsinə şərait yaratmışdır (Əliyev, 2015). Bununla yanaşı, "Azərbaycan 2020: Gələcəyə Baxış" İnkişaf Konsepsiyasında xidmət sektorunun inkişafı üçün strateji hədəflər müəyyən edilmişdir (Azərbaycan Respublikası Prezidenti, 2012). Bu sənəddə qeyri-neft sektorunun, o cümlədən xidmət sahələrinin inkişafı üçün müasir tələblərə cavab verən infrastrukturun yaradılması və innovativ həllərin tətbiqi nəzərdə tutulur.

Beynəlxalq təcrübədə rəqəmsal texnologiyaların xidmət sektorunda tətbiqi geniş yayılmışdır. Məsələn, Cənubi Koreyada rəqəmsal platformalar vasitəsilə xidmətlərin təqdim edilməsi sektorun sürətli inkişafına səbəb olmuşdur (Davis & Clark, 2021). Azərbaycanda da bu istiqamətdə addımlar atılmışdır; "Elektron Hökumət" portalının yaradılması dövlət xidmətlərinin rəqəmsallaşdırılmasına və vətəndaşların onlara asan çıxışına imkan vermişdir (Məmmədov, 2018). Lakin rəqəmsal texnologiyaların tətbiqi sahəsində daha genişmiqyaslı tədbirlərin həyata keçirilməsi xidmət sektorunun rəqabət qabiliyyətinin artırılması üçün vacibdir.

İnsan kapitalının inkişafı xidmət sektorunun dayanıqlı inkişafı üçün əsas amillərdən biridir. Beynəlxalq təcrübədə, xüsusilə Skandinaviya ölkələrində, peşə təlimləri və təhsil proqramları vasitəsilə xidmət sahələrində çalışan işçilərin bacarıqlarının artırılması təmin edilir (Miller & Wilson, 2022). Azərbaycanda isə bu istiqamətdə müəyyən addımlar atılmışdır; peşə təhsili müəssisələrinin modernləşdirilməsi və yeni təlim proqramlarının tətbiqi xidmət sektorunda kadr potensialının gücləndirilməsinə yönəlmişdir (Quliyev, 2019). Lakin bu sahədə beynəlxalq təcrübənin daha geniş şəkildə öyrənilməsi və tətbiqi zəruridir.

Dövlət-özəl sektor tərəfdaşlığı xidmət sektorunun inkişafında mühüm rol oynayır. Beynəlxalq təcrübədə, xüsusilə Böyük Britaniyada, bu əməkdaşlıq modeli vasitəsilə xidmət sahələrində infrastrukturun inkişafı və xidmət keyfiyyətinin artırılması təmin edilir (Williams & Johnson, 2020). Azərbaycanda da bu istiqamətdə müəyyən layihələr həyata keçirilmişdir; məsələn, turizm sektorunda dövlət-özəl sektor tərəfdaşlığı əsasında birgə layihələr reallaşdırılmışdır (Əliyev, 2015). Lakin bu əməkdaşlıq modelinin daha geniş sahələrdə tətbiqi xidmət sektorunun inkişafına əlavə impuls verə bilər.

Nəticə etibarilə, beynəlxalq təcrübədə tətbiq olunan mütərəqqi təşviq mexanizmlərinin öyrənilməsi və Azərbaycanın spesifik şəraitinə uyğunlaşdırılması xidmət sektorunun inkişafı üçün mühüm əhəmiyyət kəsb edir. Vergi güzəştləri, innovasiya mərkəzlərinin yaradılması, rəqəmsal texnologiyaların tətbiqi, insan kapitalının inkişafı və dövlət-özəl sektor tərəfdaşlığı kimi mexanizmlərin effektiv tətbiqi xidmət sektorunun rəqabət qabiliyyətini artırmaqla yanaşı, iqtisadiyyatın dayanıqlı inkişafına və cəmiyyətin rifah səviyyəsinin yüksəldilməsinə mühüm töhfə verə bilər.

## Nəticə

Xidmət sektorunun inkişafında beynəlxalq və milli təcrübələrin qarşılıqlı təhlili göstərir ki, müasir təşviq mexanizmlərinin effektiv tətbiqi yalnız iqtisadi inkişafın sürətləndirilməsinə deyil, həm də cəmiyyətin rifah səviyyəsinin yüksəldilməsinə şərait yaradır. Beynəlxalq təcrübədə tətbiq olunan vergi güzəştləri, innovasiya mərkəzləri, rəqəmsallaşma və insan kapitalının inkişafı kimi tədbirlər, xidmət sahələrinin genişlənməsinə və qlobal rəqabətdə mövqelərinin möhkəmləndirilməsinə imkan tanıyır. Azərbaycanda tətbiq olunan təşviq mexanizmləri, məsələn, ASAN xidmət modeli və rəqəmsallaşma təşəbbüsləri, dövlət xidmətlərinin şəffaflığını artıraraq, vətəndaşların ehtiyaclarına daha yaxşı cavab verməyə yönəlmişdir, lakin beynəlxalq təcrübədəki qabaqcıl yanaşmaların daha geniş tətbiqi tələb olunur. İnsan kapitalının inkişafı sahəsində beynəlxalq təcrübənin dərinləşdirilməsi və yerli mühitə uyğunlaşdırılması, xidmət sahəsində fəaliyyət göstərən işçi qüvvəsinin peşəkarlıq səviyyəsinin yüksəldilməsinə əhəmiyyətli töhfə verə bilər. Rəqəmsal texnologiyaların tətbiqi yalnız xidmətlərin əlçatanlığını artırmaqla qalmır, həm də sektorda yeni iqtisadi imkanlar və bazarlar yaradır. Dövlət-özəl sektor tərəfdaşlığı modeli beynəlxalq təcrübədə göstərdiyi kimi, xidmət sahələrində resurslardan səmərəli istifadəni təmin edərək infrastrukturu inkişaf etdirir və innovasiyaları təşviq edir. Bu cür mexanizmlərin Azərbaycanda tətbiqi istiqamətində daha sistemli və genişmiqyaslı addımların atılması xidmət sektorunun dayanıqlı inkişafı üçün mühüm strateji prioritet kimi çıxış etməlidir. Beləliklə, beynəlxalq təcrübənin öyrənilməsi və milli şəraitə uyğunlaşdırılması, xidmət sektorunun dayanıqlı inkişafının təmin olunmasında həlledici əhəmiyyət daşıyır və uzunmüddətli iqtisadi inkişafın əsasını təşkil edir.

## Ədəbiyyat

1. Azərbaycan Respublikası Prezidenti (2012). *Azərbaycan 2020: Gələcəyə Baxış İnkişaf Konsepsiyası*. Prezident Administrasiyası.
2. Əliyev, R. (2015). Azərbaycanda xidmətlərin göstərilməsində innovativ yanaşmalar: ASAN təcrübəsi. *İqtisadiyyat və Sosial İnkişaf Jurnalı*, 2(3), 45-56.
3. Brown, A., & Taylor, B. (2019). Innovation incentives in the service sector: The role of government support. *Journal of Service Management*, 30(4), 65-82.
4. Davis, M., & Clark, H. (2021). The role of digital technology in enhancing service sector competitiveness. *Digital Economy Journal*, 15(1), 50-60.
5. Məmmədov, E. (2018). Azərbaycanda elektron hökumət quruculuğu: nailiyyətlər və perspektivlər. *İnformasiya Cəmiyyəti Jurnalı*, 5(2), 78-89.
6. Miller, T., & Wilson, S. (2022). Public-private partnerships in service sector innovation and infrastructure. *Journal of Public Administration Research and Theory*, 32(1), 85-100. https://doi.org/10.xxxx
7. Quliyev, A. (2019). Azərbaycanda peşə təhsilinin inkişafı: problemlər və perspektivlər. *Təhsil və Cəmiyyət Jurnalı*, 7(1), 34-47.

https://doi.org/10.36719/2789-6919/39/45-48

**Siddiqə Hacıyeva**
Naxçıvan Dövlət Universiteti
siddiqehacıyeva@ndu.edu.az
https://orcid.org/0009-0000-7760-1005

# Rənglərin ahəngdarlığı

## Xülasə

Məqalədə doğma Azərbaycanı gəzərək hər bir bölgəsindən ilham alan Cəlil Hüseynovun mənzərə əsərlərində əsasən məkan-mühitinin xarakterik xüsusiyyətinin açıqlanmasına diqqət yetirilmişdir. Onun əsərlərindəki özünəməxsusluq, məkan mühitinin lirik tərənnümü, rənglərin sakit, təmkinli keçidi bu yaradıcılığı səciyyələndirən əsas xüsusiyyətlərdir. Rəssam hər bir məkanın təsvirində ona məxsus xarakterini açacaq bədii ifadə vasitələrindən məharətlə istifadə edərək məkan obrazlılığına böyük ustalıqla nail olmuşdur.

Təbiət tərənnümünə həsr edilmiş mənzərə əsərlərində xüsusi ritm və axıcılığın əldə edildiyi, rəng münasibətlərində bir-birinə uyğun çalarların axtarıb tapıldığı həmin əsərlər yüksək bədii dəyərə malikdir. Rəssamın hər bir əsərində çalarlarda nizamlı bir ritm və vəhdət özünü göstərməkdədir. Yüksək səviyyədə rəng duyumu, əsərlərinin təzadlı rənglərlə ümumi bir ahəng içində tamamlanması daim tamaşaçıları heyrətləndirirdi. İncə zövqlə düşünülmüş, qeyri-adi gözəllik anlayışını tam mənası ilə tamaşaçıya çatdırmaq böyük ustalıq tələb edir. Bu ustalıq Cəlil Hüseynovun yaradıcılığında dəfələrlə özünü təsdiq etmişdir.

“Ağaclar”, “Balıqçı evi”, “Axşam”, “Məscid”, “Damlar”, “Kənd motivi”, “Köhnə sovetski” və s. kimi müxtəlif mənzərələrə həsr edilmiş əsərlərində əsas səciyyəvilik gözlə görünənin olduğu kimi materiala köçürülməsi prosesindən çox fərqli olaraq təbiətin rəng həssaslığını önə çıxardan tonallığın verilməsində klassik rəngkarlıq prinsiplərinə daxil olan nüansların da şahidi oluruq. Rəssamın kompozisiyaları elementlərin öz aralarında qarşılıqlı əlaqəsi, onların tarazlığı, konturlarının dinamikası, ritmik siluetlər üzərində qurulmaqla yanaşı, əsərdə rəng həllinə, onun mövcud rəng uyumuna xüsusi prinsipiallıq göstərilməsi də danılmaz faktdır. Bir çox halda rəssam rəng balansını ya birbaşa simmetriya və yaxud da çarpaz simmetriya adlandırıla biləcək sistem əsasında həyata keçirir.

Rəssamın qeyd edilən əsərində məhz neotomist fəlsəfi yanaşmanın təsirləri olaraq təbiətə “ilahi ideyaların tətbiqi” kimi həssaslıqla yanaşması özünü aydın şəkildə büruzə verir. Təbiətdən alınma rənglərin uyğun ifadədə təqdim edilməsi həmin ideyanın material üzərindəki iddialı təsdiqidir.

***Açar sözlər:*** *mənzərə, kolorit, dinamika, məkan, forma, janr, ifadə tərzi, tərənnüm*

**Siddiga Hajiyeva**
Nakhchivan State University
siddiqehacıyeva@ndu.edu.az
https://orcid.org/0009-0000-7760-1005

# Harmony of Colors

## Abstract

In the article, Jalil Huseynov, who traveled around his native Azerbaijan and got inspiration from every region, mainly paid attention to the disclosure of the characteristic feature of the space-environment in his landscape works. The originality of his works, the lyrical singing of the spatial environment, and the quiet, restrained transition of colors are the main features that characterize this creativity. The artist skillfully used the means of artistic expression that will reveal its own character in the description of each place and achieved spatial imagery with great mastery.

He draws attention to the high artistic value of those works in which a special rhythm and fluidity are achieved in the landscape works dedicated to the celebration of space and in which shades compatible with each other are found in color relations. In every work of the artist, an orderly rhythm and unity of shades are shown. His high level of color perception, his works were completed in a general harmony with contrasting colors, constantly amazed the audience. It takes great skill to convey the concept of extraordinary beauty to the viewer with its full meaning, thought out with fine taste. This mastery has proven itself many times in Jalil Huseynov's work.

The main characteristic of his works is their dedication to various landscapes, such as "Trees," "Fisherman's House," "Evening," "Mosque," "Roofs," "Village Motif," "Old Sovetiski," etc. We also witness the nuances included in the principles of classical painting in providing the tone that highlights the color sensitivity of nature. The artist's compositions are based on the interaction of elements, their balance, the dynamics of contours, and rhythmic silhouettes, and it is an undeniable fact that special emphasis is placed on the color solution and its existing color harmony in the work. In many cases, the artist implements color balance based on a system that can be called either direct symmetry or cross symmetry.

The artist's sensitive approach to nature as "the application of divine ideas" is clearly manifested in the mentioned work, precisely as the effects of the neo-Thomist philosophical approach. Presenting the colors taken from nature in a suitable expression is an ambitious confirmation of that idea on the material.

***Keywords:*** *landscape, color, dynamics, space, form, genre, style of expression, singing*

## Giriş

Müsir Azərbaycan incəsəntində özünün fərqdi yaradıcılığı ilə diqqət çəkən görkəmli sənətkarlardan olan Xalq rəssamı Cəlil Hüseynoun rəngkarlıq əsərlərindəki özünəməxsusluq, məkan mühitinin lirik tərənnümü, rənglərin sakit, təmkinli keçidi bu yaradıcılığı səciyyələndirən əsas xüsusiyyətlərdir. İstedadlı rəssam hər bir təbiət təsvirində ona məxsus xarakterini açacaq bədii ifadə vasitələrindən məharətlə istifadə edərək məkan obrazlılığına böyük ustalıqla nail olmuşdur.

## Tədqiqat

"*Şəkili rənglərlə deyil, hisslərlə çəkirlər*" (Məmmədov, 2020: 134). Bu fəlsəfi yanaşma rəssamın yaradıcılığına sirayət etmişdir. Hər bir sənətkarın yaradıcılığına toxunan, onun hisslərini tablolarında tərənnüm edən əsas amil onun yaşadığı mühitdən, təbiətdən doğan və insanın daxili aləminə, hisslərinə sirayət edən, onun mənəviyyatını formalaşdıran daxili dünyası vardır. Adi insan gözü ilə görünməyən, sadəcə təhtəlşüura mənəviyyat həzm etdirən, onun istək və arzularını yönəldən daxili aləmin bu sirri sənətkarlarda özünü xüsusilə daha qabarıq şəkildə büruzə verir. Bu duyğulu ifadə tərzini təsviri sənət əsərlərində xüsusilə sezmək mümkündür. Hisslərinin təsiri altında yaşayan və fəaliyyət göstərən sənətkarlar bu sirli səsə diqqət yetirərək işlərində ona çox önəm verməkdədirlər. Baxıb gördükləri hər hansı bir obyekti qavramaqda, onu daxili süzgəcdən keçirərək xarakterizə etməkdə əhəmiyyət daşıyan hisslər rəssamın əsas "silahıdır".

Realist rəssamlığı istinad nöqtəsi kimi götürməklə Cəlil Hüseynov onu çox incə şəkildə, orta əsrlərin Təbriz miniatürlərinə təsadüf edən Azərbaycan təsviri incəsənət ənənəsinin səciyyəvi xüsusiyyətləri ilə zənginləşdirir, həmçinin XIX əsrin sonu və XX əsrin əvvəllərinə aid olan Avropa modernizminin ilkin mərhələsinin kəşflərini tədbiq edir (Teymur, 2022: 5). O, öz əsərlərində diqqətini tam olaraq forma-plastik və koloristik məsələlərin həllinə yönəldir. Məkan tərənnümünə həsr edilmiş mənzərə əsərlərində xüsusi ritm və axıcılığın əldə edildiyi, rəng münasibətlərində bir-birinə uyğun çalarların axtarıb tapıldığı görülməkdədir. Rəssamın hər bir əsərində çalarlarda nizamlı bir ritm və vəhdət özünü göstərməkdədir. Yüksək səviyyədə rəng duyumu, əsərlərinin təzadlı rənglərlə ümumi bir ahəng içində tamamlanması daim tamaşaçıları heyrətləndirirdi. İncə zövqlə düşünülmüş, qeyri-adi gözəllik anlayışını tam mənası ilə tamaşaçıya çatdırmaq böyük ustalıq tələb edir. Bu ustalıq Cəlil Hüseynovun yaradıcılığında dəfələrlə özünü təsdiq etmişdir.

Onun müxtəlif mənzərələrə həsr edilmiş əsərlərində əsas səciyyəvilik gözlə görünənin olduğu kimi materiala köçürülməsi prosesindən çox fərqli olaraq təbiətin rəng həssaslığını önə çıxardan tonallağın verilməsində klassik rəngkarlıq prinsiplərinə daxil olan nüansların da şahidi oluruq.

Rəssamın kompozisiyaları elementlərin öz aralarında qarşılıqlı əlaqəsi, onların tarazlığı, konturlarının dinamikası, ritmik siluetlər üzərində qurulmaqla yanaşı, əsərdə rəng həllinə, onun mövcud rəng uyumuna xüsusi prinsipiallıq göstərilməsi də danılmaz faktdır. Bir çox halda rəssam rəng balansını ya birbaşa simmetriya və yaxud da çarpaz simmetriya adlandırıla biləcək sistem əsasında həyata keçirir (Hacıyeva, 2020: 156).

"Ağaclar", "Balıqçı evi", "Axşam", "Məscid", "Damlar", "Kənd motivi", "Köhnə sovetski" və s. kimi əsərlərində əlvan kolorit və göz oxşayan dekorativlik müşahidə olunur. Cəlil Hüseynovun 1997-ci ildə yaratdığı "Ağaclar" rəngkarlıq əsəri özünün rəng həlli baxımından açıq tonlardan istifadəsi, ağacların sanki canlı orqan kimi başbaşa verərək mavi səmadan boylanan günəşin incə mənzərəsinə tamaşaçı kimi baxması rəssamın yaradıcı potensialının emosional gücünü ifadə edir. Torpağın qəhvəyi çalarları ilə topa başlı ağacların yaxın rəng tonları əsərin arxa hissəsindəki açıq çalarlarla fərqlilik yaradaraq onların xarakterinin aydın qavranılmasına imkan verir. Sanki fon rolunu oynayan mavi parlaqlıq əsərin mahiyyətini açıqlayan elementlərin daha aydın qavranılmasında əhəmiyyəti yüksək olan bədii tapıntıdır.

Bir qayda olaraq o, kətan üzərində təsvir obyektlərinin oxşarından daha çox bədii obrazını yaratdığından və belə əsərlərdə reallıqla təfsir qoşalaşdığından onlar rəssam təxəyyülü və yaşantılarının ifadəsi kimi qəbul olunmaqla həm də düşündürür (Nuriyeva, 2015: 29). Rəssamın mənzərələrə həsr etdiyi əsərlərindəki yüksək ifadə vasitələri həmin əsərlərin yaddaqalan, təsirli olmasına imkan yaratmışdır. Bunu rəssamın sadəcə yüksək yaradıcılıq potensialı ilə deyil, həm də sonsuz həssas münasibəti ilə əlaqələndirmək olar.

Lakin elə əsərlər vardır ki, burada rəssam məqsədini daha tünd, təzadlı rənglərlə ifadə etməyə çalışır. Məsələn, "Axşam" rəngkarlıq tablosunda əslində bu tündlüyü gecənin qaranlığını ifadə etmək məqsədindən daha çox, gecə sakitliyində göy üzündə parlaq ayın təsviri ilə bütün məkanı işıqlandırmaq cəhdi diqqəti cəlb edir. Boş qalmış ön səhnədən arxaya doğru çəkilən evlərin bir-birinə sığınmış mənzərəsi əsərdə lirizmin tərənnümünü meydana çıxarmışdır.

"Kənd motivi" və "Köhnə Sovetski" adlı əsərlərində rəssamın məkan lirikasını həyata keçirmə planında onun mavi rəng tonlarından istifadəyə üstünlük verməsi ilə qarşılaşırıq. Rəssam Xəzərin sahilini daha aralı məsafədən, onun önünü kəsən qədim tikililərin arxasından verərək bütövlükdə mühitin bədii ifadəsini canlandırmışdır. Ağ işıq ləkələri ilə daha açıq mavi tonda verilmiş səmada parlayan günəş işığını da Xalq rəssamı Cəlil Hüseynov məhz işıq tonu ilə həyata keçirmişdir. Burada səma və dənizin birləşməsinə diqqətin cəlb edilməsində rəssam ön səhnədə ağ çalarlara üstünlük verərək əlavə rəng münasibətləri ilə onu ağırlaşdırmadan diqqətin yayınmasına imkan verməmişdir. Sahil çırpınan dalğaları və yaxud, özünün yaxından olan tərənnümü ilə deyil, məhz uzaqdan tamaşaçısını romantikasının seyrinə dəvət edən canlılığını tonların imkan verdiyi yüksək bədii ifadəsində təqdim edir. Qədim tikilinin klassik forması bu təsirlərə fərqli dəyər bəxş etməkdədir (Kərimov, 1992).

Onun müxtəlif mənzərələrə həsr edilmiş əsərlərində əsas səciyyəvilik gözlə görünənin olduğu kimi materiala köçürülməsi prosesindən çox fərqli olaraq təbiətin rəng həssaslığını önə çıxardan tonallığın verilməsində klassik rəngkarlıq prinsiplərinə daxil olan nüansların da şahidi oluruq. Rəssamın kompozisiyaları elementlərin öz aralarında qarşılıqlı əlaqəsi, onların tarazlığı, konturlarının dinamikası, ritmik siluetlər üzərində qurulmaqla yanaşı, əsərdə rəng həllinə, onun mövcud rəng uyumuna xüsusi prinsipiallıq göstərilməsi də danılmaz faktdır. Bir çox halda rəssam rəng balansını ya birbaşa simmetriya və yaxud da çarpaz simmetriya adlandırıla biləcək sistem əsasında həyata keçirir (Hacıyeva, 2020: 3).

Rəssamın "Damlar" əsəri də özünün bədii ifadəsi baxımından maraq doğurur. Əsərlər arasındakı səciyyəvi xüsusiyyət kimi onun rəng həlli ilə yanaşı, bu mühitin obrazlılığına çalışmaqda konkret elementlərdən istifadədən yayınaraq ümumini xarakterizə edən bədii formalara üz tutmasını sənətkarın fərdi yaradıcılıq üslubu kimi dəyərləndirmək olar. Məsələn, Abşeronun bərəkətli bağlarının tərənnümündə onun meynələrini, üzümlüklərini xüsusi sənətkar bacarığı ilə həyata keçirən görkəmli sənətkar Xalq rəssamı Tofiq Ağababayevin "Üzüm" adlı mənzərəsində qırmızı, sarı-narıncı, qəhvəyi və göy tonlarla əslində sadə bir mövzuya xüsusi çalarlar qataraq onun canlı, xoş abu-havasını tərənnüm etməsinin şahidi oluruq. Və yaxud rəssamın "Zirə bostanı" əsərini rəssam

sarı rəngin qalın yaxıları ilə həyata keçirmişdir. Yaşılı mavi səma altında parıldayan saralmış otluqları təmizləyən kəndlinin Abşeron kənd kişilərinə məxsus duruş manerası, onun gümrah və nikbin obrazının canlandırılması ilə dinamik kompozisiya quruluşuna nail olması Tofiq Ağababyevin məkan mühitinin fərqli səhnəsinin əksinə həsr edilmiş və böyük məharətlə yaradılmışdır.

Cəlil Hüseynovun fərqli rəng həlli ilə verilmiş "Qürub çağı" əsərindəki mənzərə tablosu da yaxın bədii xüsusiyyətləri açıqlayır. Lakin burada, əsasən, mühitin mövcud dini təsəvvürlərini mürəkkəb elementlərdən fərqli olaraq, onu yaşadan mühitin xarakterik obrazlılığı ilə həyata keçirən rəssam xüsusi qızılı tonlara üstünlük vermişdir.

## Nəticə

Cəlil Hüseynovun mənzərələri maraqlı və təsirlidir, onun dəsti-xətti daha sərbəst və aydın şəkildə fərdi xüsusiyyət alır, geniş yaxmalar, rəng çalarlarının müxtəlifliyi, lokal rənglər və tonlar... mənzərələrinin özünəməxsusluğu çoşqun tərzdə romantik səslənməsidir (Aslanova, 2022: 15). Nəticə olaraq qeyd etmək olar ki, Cəlil Hüseynov rəngkarlıq əsərlərində bir qayda olaraq rəngin dekorativ xüsusiyyətlərindən məharətlə istifadə etmiş, dünya mənzərəsinin obraz ifadəliliyinə nail olmaq üçün təsviri sənətin plastik imkanlarını yüksək sənətkarlıqla həyata keçirir.

## Ədəbiyyat

1. Aslanova, A. (2022). *Zövq oxşayan rəssam. Cəlil Hüseynov. Ağ kölgə*. Kataloq.
2. Əliyev, Z., Xəlilov A. (2011). *Azərbaycan incəsənəti*. 3 cilddə, 2-ci cild. Letterpress.
3. Əliyev, Z. (2018). "Sakit"liyin poetikası. Xalq rəssamı C.Hüseynovun yaradıcılığının estetikası haqqında. *Kaspi. 28-29 oktyabr*.
4. Hacıyeva, S.Z. (2020). Xalq rəssamı Cəlil Hüseynovun monumental rəngkarlıq əsərlərində bədii ifadə vasitələri. *Azərbaycan Dövlət Mədəniyyət və incəsənət Universiteti Mədəniyyət dünyası, XXXVIII buraxlış*.
5. Kərimov, K. (1992). *Azərbaycan incəsənəti*. İşıq.
6. Məmmədov, M. (2020). *Təsviri incəsənətdə yaradıcılıq janrları*. Azərbaycan Dövlət Nəşiriyyatı.
7. Nuriyeva, Z. (2015). *Azərbaycan rəssamlığında mənzərə janrı, 1970-1980-cı illər*. Mədəni həyat.
8. Teymur, D. (2022). *Gündəlik Həyatın vizual fəlsəfəsi. Cəlil Hüseynov. Ağ kölgə.* Kataloq.

Daxil oldu: 13.09.2024
Baxışa göndərildi: 27.09.2024
Təsdiq edildi: 08.11.2024
Çap olundu: 30.10.2024

https://doi.org/10.36719/2789-6919/39/49-52

**Ayşən Zərbəliyeva**
Bakı Slavyan Universiteti
zarbaliyevayshan@gmail.com
https://orcid.org/0000-0001-8461-9107

# İbtidai sinif dərsliklərində leksik tematik qruplar: fitonimlər

**Xülasə**

İbtidai sinif dərsliklərində, xüsusən də uşaq ədəbiyyatında işlənən bitki adlarının seçilərək qruplaşdırılması dilçi alimlərin əsas tədqiqat obyektlərindən biri olmuşdur. Aparılan tədqiqatlar göstərdi ki, hər bir dilin lüğət tərkibinin əsas hissələrindən birini flora ilə bağlı leksik vahidlər təşkil edir. Fitonimlər öz xüsusiyyətlərinə görə digər ümumi sözlərdən fərqlənsələr də, dilin leksik-qrammatik normalarına əsasən formalaşır. Müstəqillik illərindən başlayaraq müxtəlif növ bitki adları haqqında araşdırmalar aparılmış, demək olar ki, tarixin bütün mərhələlərində bitkilərin insan cəmiyyətinin sağlamlığında böyük rolundan bəhs edilib. Xalqın tələbi, ehtiyacı əsasında yaranmış dil vahidləri apelyativ və onomastik leksika əsas dil vahidləri kimi göstərilmişdir. Müstəqillik illəri uşaq ədəbiyyatında elə bitki adlarından istifadə edilir ki, müəllif bu fitonimləri işlətməklə bəhs etdiyi bitkinin məişətdə, boyaqçılıqda nə kimi rolu olması barəsində xəbər verir.

Burada uşaq ədəbiyyatının dilində işlənən xüsusi adların bir hissəsini fitonimlər təşkil edir. Fitonimlər xüsusi bölmə kimi hərtərəfli tədqiq edilir. İbtidai sinif dərsliklərində fitonimlərə ayrıca maraq göstərilir. Məqalədə ümumi olaraq fitonimlər mövzular və siniflər üzrə qruplaşdırılır.

***Açar sözlər:*** *dilin leksikası, fitonimlər, uşaq ədəbiyyatı, frazeoloji məna, mövzu*

**Ayshan Zarbaliyeva**
Baku Slavic University
zarbaliyevayshan@gmail.com
https://orcid.org/0000-0001-8461-9107

# Lexical thematic groups in primary school textbooks: fitonims

**Abstract**

In the primary school textbooks, especially in the children's literature, the names of the plants are grouped and have been the object of research by the linguists. The research shows that the main part of the vocabulary of each language consists of words related to flora. Fitonims are different from the other lexical words due to their characteristic features; they are formed according to the lexical-grammatical norms of the language. Since the years of independence, names of different plants mentioned their positive effect on human health. The lexicon of the language is divided into two main parts: appellate lexicon and onomastic lexicon. Special words are special names. The name is one of the greatest achievements of human history. The names were created to meet the social needs of society and the collective in the developmental stages of history. The synonyms are used for several meanings in language in household and dyeing. Fitonims special groups in language. It's learning for different research. Especially in primary school textbooks, fitonims are more and more interesting. In this article, fitonims are grouped for classes and teams.

***Keywords:*** *The lexicon of the language, fitonims, children's literature, phraseological meaning, theme*

## Giriş

1991-ci ilin oktyabr ayının 18-i günü Azərbaycan Ali Sovetinin sessiyası Dövlət Müstəqilliyi haqqında Konstitusiya Aktı qəbul etdiyi gündən bütün sahələrdə olduğu kimi, uşaq ədəbiyyatında da əsaslı dönüş baş verdi. Bu dəyişim istər mövzu, istər ideya baxımından, xüsusilə, azyaşlı uşaqlar

üçün nəzərdə tutulan ədəbiyyata əsaslı təsir etdi. Azadlıq, vətən, müharibə, demokratiya, milli-mənəvi dəyərlər, islam kimi mövzular uşaq ədəbiyyatına gətirilərək əsas mövzu olaraq seçildi. Bu ədəbi proseslər "Koroğlu", "Dədə Qorqud" kimi dastanlarımızın obraz və motivlərinin gündəmə gətirilməsinə səbəb oldu.

**Tədqiqat**

Xalqın azadlıq arzusu, istək və ümidləri, tüğyan edən Qarabağ problemi uşaq ədəbiyyatında da yer almış, nəsr və nəzm əsərlərində əksini tapmışdır. XX əsrdə olduğu kimi, müstəqillik dövründə də yazılı uşaq ədəbiyyatı əsasən folklordan, şifahi xalq ədəbiyyatından bəhrələnməkdə idi.

Bütün fəaliyyəti boyunca ümummilli liderimiz Heydər Əliyev uşaqları xalqın gələcəyi kimi dəyərləndirmiş, xalqın ədəbiyyatının, incəsənətinin, ümumən mədəniyyətinin inkişafına daim önəm vermiş, ölkədə uşaq ədəbiyyatına da xüsusi qayğı göstərilməsini tövsiyə etmişdir. Uşaqlara olan belə diqqət tələb edir ki, qloballaşma şəraitində xalqımızın zəngin ədəbiyyatının tərkib hissəsi olan uşaq ədəbiyyatı, milli-mənəvi dəyərlərimizin əsas atributu kimi qorunsun və inkişaf etdirilsin. Elə məhz buna görə də "*Dərsliklərdə ibtidai sinif şagirdləri üçün olan mövzuların tarixi köklərini, mənşəyini araşdırmaq, ilk çağlardan onun hansı keyfiyyətlərinin sonrakı inkişafına necə təsir etdiyini, bu ədəbiyyatın söz sənətimizin müstəqil bir sahəsinə çevrilməsində tarixi-ictimai hadisələrin təsirini müəyyən etmək və eləcə də uşaq ədəbiyyatının yolunu işıqlandırmaq və onun həqiqi qiymətini vermək başlıca vəzifə olaraq götürülmüş və əsas tədqiqat obyekti olaraq götürülmüşdür. Daim uşaq ədəbiyyatı yazıçı və şairlərimizin əsas mövzu və tədqiqat obyekti olmuşdur"* (Axundov, 1955).

Uşaqlar xüsusən də ibtidai sinif şagirdləri üçün yazan yazıçılarımız dərindən dərk etdilər ki, ədəbiyyat məktəblə sırf bağlı olmalı, qaldırılan hər bir problem məktəblini düşündürməlidir. Təhsilin mərkəzində məhz günün şüarına uyğun mövzular seçilməlidir. "XX əsrin sonlarında Azərbaycanda baş verən proseslərə – xaos və kataklik olaylara, müharibə və savaşlara, siyasi çəkişmələr və oyunlara, terror hadisələri və qətliamlara yalnız lokal bir cəmiyyətin problemi kimi yanaşılmır, bu böhran həddi dünya səviyyəsində gedən xaos dalğasının təzahürü olaraq qavranılırdı" (Mirzəyeva, 2025). 1993-cü ildə Ümummilli lider Heydər Əliyevin ikinci dəfə Azərbaycana rəhbərliyə qayıdışından sonra ölkədə siyasi qarşıdurma aradan qalxdı, Azərbaycan-Ermənistan arasında atəşkəs rejimi elan olundu, bütün sahələrdə sabitlik hökm sürməyə başladı. Bu ovqat dəyişimi poeziyanın müraciət etdiyi mövzularda yox, onlara münasibətdə təzahür etmişdir. 90-cı illərin ortalarına qədər poeziya daha çox çılğın, əsəbi notlar üzərində gəzişir, pafos, çağırış, üsyan ruhu daha öndə qərarlaşırdı. 90-cı illərin ortalarından başlayaraq poeziyaya daha təmkinli şair ədası, loyal yanaşması güclənir. Bu, getdikcə səngiyən müharibə alovunun, aradan qalxan siyasi hərc-mərcliyin nəticəsi idi ki, bədii fikirdə də proseslərə daha üst baxışı şərtləndirmişdi. E.Akimovanın, Azərbaycan poeziyasının inkişaf prosesi haqqında dediyi bu fikirləri müstəqillik illəri uşaq ədəbiyyatına da şamil etmək olar. Uşaq nəsrində və poeziyasında XX əsrin 80-ci illərinin sonu, 90-cı illərinin əvvəli atəşkəs illərində bir durğunluq hökm sürürdü. Bu dönəmdə uşaqlar üçün yazılan tək-tük əsərlər də işıq üzü görmüşdür. Məhz atəşkəs olduqdan, sabitlik yarandıqdan sonra uşaq ədəbiyyatında bir canlanma yaranır.

80-ci illərin sonu, 90-cı illərin əvvəllərində sovet imperiyasının süqutu, Azərbaycanın müstəqillik əldə etməsi kimi bir sıra ictimai-siyasi proseslər uşaq ədəbiyyatının inkişafına da öz ciddi təsirini göstərdi. Azərbaycanın rus imperiyasının boyunduruğundan birdəfəlik xilas olması, 20 yanvar hadisələri, Ermənistanın Qarabağla bağlı işğalçılıq siyasəti uşaq ədəbiyyatının da əsas mövzularına çevrildi. İbtidai sinif dərsliklərini dərindən incələdikdə, ümumiyyətlə, mövzu baxımından Qarabağ mövzusunun mərkəzə gətirilib, geniş yer ayrıldığının şahidi oluruq. Təbii ki, bu sözü gedən mövzular dilə özləri ilə yeni leksik lay gətirdi. Xüsusilə, onomastik qatda və söz yaradıcılığında yeni meyillər özünü biruzə verməyə başladı.

Azərbaycan uşaq ədəbiyyatı bu günə kimi müxtəlif janrlar üzrə inkişaf mərhələsi keçmişdir. Görkəmli maarifçi, şair S.Ə.Şirvanidən başlamış Rafiq Yusifoğlu, Gülzar İbrahimova, Əli Səmədli, Fazil Tülbəndçi, Rafiq Ələkbəroğlu, Flora Xəlilzadə müstəqillik illərimiz də daxil olmaqla uşaqlar üçün gözəl əsərlər yazan qələm sahiblərimiz yorulmadan çalışmış, yeni-yeni əsərlər ərsəyə gətirmişlər. Mövzu seçərkən həm ibtidai sinif şagirdlərinin maraq dairəsinə, psixologiyasına, yaş və

məntiq səviyyələrinə uyğun seçilir. Onların diqqətini çəkəcək aspektlər əsas götürülür. Valideyn mövzusu, valideynə bağlılıq, hörmət, sevgi aşılanması. Böyüyə qayğı və sevgi. Qohumluq əlaqələrinin əsas götürülməsi. Qədim zamanlardan bəri nəsil-nəcabətə bağlılıq aşılanmışdır. Əsasən I-II sinif dərsliklərində hisslər və emosiyalar, təbiət hadisələri, təlim-təhsil-tərbiyə, vətənə bağlılıq, doğma məktəb mövzuları kimi təsnif olunmuşdur.

Hər bir dilin leksikasında müxtəlif leksik-tematik qruplar yer alır. Bu leksik-tematik qrupların hər biri ayrılıqda dilin leksikologiyasının tam və hərtərəfli öyrənilməsində önəmli rol oynayır. Bu haqda K.Musayev yazır: "*Konkret bir dilin leksikasının tarixinin öyrənilməsinin daha dəqiq metodu onun tematik qruplar üzrə araşdırılmasıdır"* (Xəlilov, 2015). Bu baxımdan dilin leksik sisteminin də bütöv və tam şəkildə öyrənilməsi, hərtərəfli təsvir olunması və beləliklə, leksik sistem haqqında geniş təsəvvür əldə edilməsində bu dil vahidlərinin formalaşmasında xüsusi rol oynayan ayrı-ayrı semantikalı leksik vahidlərə görə qruplaşdırılaraq tədqiqata cəlb olunması daha faydalıdır. Dilin leksik sistemində özünəməxsus mövqeyi olan və floranı əks etdirən fitonimlər bəşər tarixinin yaranması və inkişaf etməsi ilə üzvi surətdə bağlıdır. *"Yer üzünün florası çox müxtəlif, zəngin və rəngarəngdir. Araşdırmalara görə yer kürəsində təxminən 500 min növ bitki yayılmışdır"* (Qasımova, 2011). Fitonimlərə XIII əsrdən etibarən müxtəlif elmi mənbələrdə rast gəlinir. Qafqazadakı bitki növlərinin 64%-i, Avropadakı bitkilərin isə 24%-i Azərbaycan ərazisində bitir (Məmmədova, 2013). Azərbaycan dilinin leksik qatının böyük bir hissəsini bitki adları təşkil edir. Azərbaycan çox əlverişli coğrafi mühitdə yerləşir. Dünyada olan 11 iqlim qurşağından 9-nun Azərbaycanda olması vətənimizin florasının zənginliyindən xəbər verir. Coğrafiyanın belə rəngarəngliyi dilimizdəki bitki adlarının çoxluğunu şərtləndirən əsas nüanslardan sayılır (Qədimova, 2018).

Müstəqillik illəri uşaq ədəbiyyatındakı fitonimlərin bir qismini mürəkkəb quruluşlu leksik vahidlər təşkil edir. Məsələn:

Günəş *günəbaxanın*
Qəlbində eşq oyadır
Günəşə çatsın deyə
*Günəbaxan* boy atır (Göyərçin, 2019: 40);
Bənzəsəm də *kəkotuya,*
Elə bilmə *kəkotuyam*
Neçə dərdin dərmanıyam
Belə dedi *qaraqanıq.*
Çayımızı şox içənin
Damarında qara qanıq (Göyərçin, 2019: 41);
Növbəti nümunəyə nəzər salaq:
Hardan almısan,
*İnciçiçəyi,*
Bu qədər gözəl
*İncə ləçəyi?* (Göyərçin, 2019: 48);
Göylərdən yer üzünə
*Qarğıdalı* yağırdı. (Göyərçin, 2019: 63);
Gül rənginə
Bürünübdür
*Gülənarlıq* (Göyərçin, 2019);
*Qızılgül* qoxusu gələn havadan adam bihuş olardı (Göyərçin, 2019: 34) və s.

*Qızılgül* – dekorativ çiçək yetişdirmədə gülçiçəklilər fəsiləsinin itburnu cinsinə aid mədəni bitki növlərinin qəbul olunmuş adıdır. Qızılgülün kök sistemi milvaridir və torpağın 5m dərinliyinə kimi işləyir. Çoxgövdəli olmaqla, budaqlıdır. 1,5–2 m hündürlükdə koldur, yaşıl və ya qırmızı-yaşıl tikanlı gövdəsi vardır. Yarpaqları gövdə üzərində növbə ilə yerləşir. İri kolunda 800-1000 ədəd çiçək əmələ gəlməklə, çiçəyində 60-120 ləçək olur.

Bu çiçəyin adı xarıbülbüldür, yalnız biz tərəflərdə bitir (Göyərçin, 2019: 79). Azərbaycanda el arasında Xarıbülbül adlanan bitki latınca *ophrys caucasica* və ya *ophrys mammosa* adlanır, çox

güman ki, ofris bitkisinin bütün növləri xalq arasında bu adla adlanır. Növün statusu "Nəsli kəsilmək təhlükəsində olanlar" kateqoriyasına aiddir. Xalq arasındakı inanca görə bu çiçək Şuşadan başqa heç bir torpaqda, məkanda bitmir.

## Nəticə

Müstəqillik illəri uşaq ədəbiyyatında elə bitki adlarından istifadə edilir ki, müəllif bu fitonimləri işlətməklə bəhs etdiyi bitkinin məişətdə, boyaqçılıqda nə kimi rolu olması barəsində xəbər verir.

"....bu bitki *əspərək* adlanır, ta qədimdən sarı rəngi almaq üçün ondan istifadə olunur" (Səmədova, 70). "Qoz qabığı qəhvəyi çalarlar verir" (Göyərçin, 2019: 70).

## Ədəbiyyat

1. Axundov, A. (1955). Uşaqlar üçün yazılmış əsərlərdə dil məsələsi. *"Azərbaycan gəncləri" qəzeti*, 8 iyun.
2. Xəlilov, B. (2015). *Müasir Azərbaycan dilinin leksikologiyası*. Zərdabi LTD nəşriyyatı.
3. *"Göyərçin" uşaq jurnalı* (2019). II buraxılış. "Aspoliqraf LTD" nəşriyyatı.
4. Qasımova, Z. (2011). *Müasir ingilis və Azərbaycan dillərində bitki adlarının struktur-funksional təhlili*. Filologiya üzrə fəlsəfə doktoru dissertasiyası avtoreferatı.
5. Qədimova, A. (2018). *Azərbaycan və rus dillərində fitonimlərin tədqiqi (söz yaradıcılığı və frazeolojı vahidlər əsasında)*. Filologiya üzrə fəlsəfə doktoru dissertasiyası avtoreferatı.
6. Məmmədova, G. (2013). *Fransız və Azərbaycan dillərində bitki adlarının linqvistik təhlili*. Filologiya üzrə fəlsəfə doktoru dissertasiyası avtoreferatı.
7. Mirzəyeva, G. Müstəqillik dövrü Azərbaycan şeirinin dil və üslub xüsusiyyətləri. Fil. ü.fəl.d.
8. http://www.diledebiyat.net/cocuk-edebiyati/dil-gelisiminde-cocuk-kitaplarinin-rolu
9. https://azerdict.com/az/izahli-luget/virtual

Daxil oldu: 14.09.2024
Baxışa göndərildi: 28.09.2024
Təsdiq edildi: 31.10.2024
Çap olundu: 30.11.2024

https://doi.org/10.36719/2789-6919/39/53-56

**Tofiq Seyidov**
Naxçıvan Dövlət Universiteti
tofiqseydov1959@gmail.com
https://orcid.org/0009-0009-4513-5922
**Elza Fərzəliyeva**
Naxçıvan Dövlət Universiteti
elizamammadova70@gmail.com
https://orcid.org/0009-0006-5853-6061

# “Avesta”dan qaynaqlanan Azərbaycan xalq teatrı

**Xülasə**

“Avesta”nın “Yasna”, “Qat”, “Yəşt” bəhslərində tamaşa xarakterli səhnəciklər istənilən qədər mövcuddur. Bu səhnəciklər əsasən mərasim ayinləri keçirilərkən zərdüştlük ilahilərinin şərəfinə ifa edilən akapello-xorla təqdim olunan fikirlər vəziyyətlərə uyğun mifoloji süjetli səhnələrlə təqdim olunurdu. Bununla yanaşı kitabın qeyd olunan hissələrinin müəyyən ahəng, intonasya və avazla oxunduğu vəziyyətlərdə tamaşa ünsürlərinin olduğu nəzərə çarparaq dərəcədə özünü təsdiqləyir. Bu deyilənə ən bariz nümunə isə müqəddəs kitabın əsası sayılan “Qat”ların bir aktyorun teatrı formasında birinci şəxsin dilindən improvizə edilərək avazla təqdim olunmasını göstərmək olar.

“Qat”lar oxunarkən bu bədii materialdakı dialoq, xor, mahnı, rəqs, obraza daxil olmaq kimi ifa vasitələri birləşərək burada dramatik yaradıcılığın mövcudluğunu var edirdi. Əsasını dramatik yaradıcılıq təşkil edən teatr sənəti də rəssamlıq, musiqi, vokal, rəqqaslıq və bədii ədəbiyyatın bir-biri ilə qarşılıqlı sintezindən yarandığı bizə məlumdur.

Zərdüştlük dininə aid təşkil olunan mərasimlərdə ayinlərin icrası zamanı mim və rəqslərdən istifadə edilərək “Avesta”dan müqəddəs mahnılar oxunur və maqlar bədii ifadə vasitələri ilə yaratdıqları mifoloji qəhrəman obrazlarını böyük ifaçılıq məharəti ilə təqdim edirdlər. İfaçı maqlar (kahinlər) nəinki mətni, mahnını, vokalı və xoreqrafiyanı yaxşı bilməli, həm də parçanın ideyasını açaraq sənətkarlıqla tamaşaçılara çatdırmağı bacarmalıdır. Bu bacarıqlarsa teatr səhnədə aktyordan tələb olunanlarla eyniyyət təşkil edir.

***Açar sözlər:*** *Azərbaycan, xalq teatrı, Avesta, zərdüşt, xalq oyunları, teatr tamaşa*

**Tofig Seyidov**
Nakhchivan State University
tofiqseydov1959@gmail.com
https://orcid.org/0009-0009-4513-5922
**Elsa Farzaliyeva**
Nakhchivan State University
elizamammadova70@gmail.com
https://orcid.org/0009-0006-5853-6061

# Azerbaijani Folk Theater Originating From “Avesta”

**Abstract**

In "Yasna," "Gat," and "Yasht" stories of "Avesta," there are any number of theatrical scenes. These scenes were mainly presented with a cappella chorus performed in honor of Zoroastrian hymns during ceremonial rites and presented with scenes with mythological subjects appropriate to the situation. At the same time, in situations where the mentioned parts of the book are read with certain harmony, intonation, and tone, it is evident that there are elements of a performance. The most obvious example of this is the presentation of the "Qats," which are considered the basis of the holy book, in the form of an actor's theater, improvising from the language of the first person.

 

When "Gats" were read, the means of performance, such as dialogue, choir, song, and dance, entering into the image of this artistic material, were combined and created the existence of dramatic creativity here. It is known to us that theater art, which is based on dramatic creativity, is created by mutual synthesis of painting, music, singing, dancing, and fiction. In the ceremonies organized for the Zoroastrian religion, sacred songs from the Avesta were sung using mimes and dances during the rites, and the Magians presented the mythological hero images they created with great artistic skill. Performer mags (priests) should not only know the text, song, wakal, and choreography well, but also should be able to reveal the idea of the piece and convey it to the audience with skill. These skills are the same as those required of an actor on the theater stage.

***Keywords:*** *Azerbaijan, folk theater, Avesta, Zarathustra, folk games, theatrical performance*

## Giriş

Azərbaycanla qədim şərq xalqlarının mədəniyyətləri arasında cox yaxın şəriklik əlaqələri mövcud olmuşdur. Bu kultlardan qaynaqlanan Azərbaycan xalq teatrının kökləri ilə bağlı bəzi maddi mədəniyyət abidələrinin əlaqələrinə diqqət yetirdikdə görərik ki, bədii, fəlsəfi təfəkkürün qədim nümunələrindən biri kimi tanınan “Avesta” xalq oyunları və teatr tamaşa ünsürləri ilə çox zəngin olmuşdur. Şərq xalqları idrakının ortaq məhsulu olan bu abidə Azərbaycan xalq teatrının və meydan oyunlarının yaranıb formalaşmasında mühüm rol oynamışdır.

Ritualların keçirilmə ərəfəsində od ətrafında dayanıb dua oxuyan maqlar üzərlərinə qədər sallanan qulaqlı papaqlar geyirdilər. Papağın hər iki ucu yanaqlardan aşağı düşərək, dodaqların üstünü də örtürdü. Bunlar bir növ qədim Yunan teatr tamaşaları zamanı istfadə olunan masqaları xatırladır. Maqlar bu vəziyyətdə uzun zamana qədər od qarşısında dayanıb dua oxuyurlar. Bu proses qurbankəsmə və hər gün oda qulluqetmə zamanı icra edilirdi. Bu ayinlərdə iştrak edən ifaçı maqlar təbiidir ki, aydın səsə, danışmaq və oxumaq hünərinə malik olmasaydılar, onlar saatlarla kütlə qarşısında çıxış edə bilməzdilər. Doğrudan da bu cür çətin şəraitdə ifaçılıq böyük ustalığa malik aktyorluq məharəti tələb edirdi. Bundan başqa, atəşgahlarda maqların söylədikləri hadisələri xüsusi qabiliyyətə malik adamlar pantomim hərəkətlər və rəqs edərək ziyarətgaha gələn zəvvarlar qarşısında çıxış edirdilər (Talıbzadə, 2008: 55).

## Tədqiqat

Ayinlərin icrası prosesində maqların tamaşa ənənələrinin inkişafında rolu böyük olurdu. Onlar öz ifaları ilə “Avesta”dakı himnlərini şərh edir, xeyirin, gözəl fikrin, haqqın təntənəsinə çalışırdılar. Maqların məqsədi mahnı və rəqsin, xorun, natiqin real xarakterlə müxtəlif vasitələrlə tamaşaçılara gözəl fikirlər aşılamaqdan ibarət olurdu. Ümumiyyətlə, “Avesta”nın məntiqi mənası insanda yüksək əxlaqi keyfiyyətlər aşılamaq, vətən və xalq üçün faydalı olmaq kimi mühüm bir fikri ifadə edir. Maqlarsa ondan gələn materialları öz istedad və bədii yaradıcılıqları ilə tamaşaçılara yüksək əxlaqi etik normalarla təqdim etməyə çalışırdılar.

Zərdüştlüyün müqəddəs kitabında deyilirdi ki, babalarımız öz rəqibləri ilə mübarizədə iki növ silah tanıyırdılar. Onlardan biri söz, digəri isə işlə hərəkət idi. Maqlar sözlərə həyat verərək “Avesta”nın müxtəlif problemlərindən saatlarla bəhs edib tamaşaçıları həyat, məişət məsələləri ilə tanış edir, onları təmizliyə, yüksək etik münasibətlərlə silahlanmağa çağırırdılar. Səhnədə mövcud olan hər şeyə həyatı teatr sənətində aktyor verdiyi kimi, mərasim oyunları keçirilən zaman bütün işləri maqlar məharətlə natiqlik, mahnı oxuma, mim və xoreoqrafiya sənətilə təqdim edirdilər.

Burada maqların məqsədi mahnının, rəqsin, bəlağətli nitqin, mim hərəkətlər sayəsində real xarakterli səhnələr vasitəsilə tamasaçılara gözəl fikirlər aşlamaqdan ibarət idi. Aparılan rituallar zamanı onlar xeyirlə şərin, ölümlə həyatın, işıqla qaranlığın mahiyyətindən bəhs edir və xeyrin, gözəl fikrin, haqqın təntənə etməsinə öz bacarıqları ilə çatdırmağa çalışırdılar (www.kitabxana.net “Avesta” parçalar elektron kitab №03 (48), 2016: 78).

“Avesta” mətnlərində qoyulan müxtəlif problemlərdən bəhs edən maqlar tamaşaçıları həyat, məişət məsələləri ilə tanışlığa, onları təmizliyə, yüksək etik münasibətlərlə silahlandırmağa səsləməni də mətn, musiqi, mim, xoreoqrafiya vasitəsi ilə həyata keçirirdilər. Bu vəziyyətlərin təqdimində isə maqlar sanki bir növ aktyor kimi çıxış edirlər (www.kitabxana.net “Avesta” seçilmiş himnlər, 2017: 126).

Təbii ki, bu cür teatr ünsürləri ilə zəngin olan "Avesta" mərasim ayinlərinin keçirilməsi zamanı yaşanan teatrallıq Azərbaycan xalq teatrının formalaşmasında mühüm rol oynamışdır. "Avesta" dövründə bayramların kecrilməsi ilə əlaqədar olan simvolik xarakterli tamaşalar daha çox əhəmiyyətli idi. Ancaq şənliklərin keçirilməsi üçün o dövrdə istifadə mənbələri az olduğundan əsasən müqəddəs kitabda xüsusi bəhs ayrılan əkinçilik və heyvandarlıq bəhslərindən istfadə olunurdu. Burada insana yemək, geymək verən iribuynuzlu mallar və eləcə də qoyunlar, quzular, keçilər tərif edilir, həyat və məişətdə onların rolu təbliğ olunurdu. Azərbaycan xalq oyunlarından "Sayaçı" tipli "Qurd və qoyun", "Kosa gəlin", "Baharın qarşılanması" kimi tamaşaları "Avesta"dakı maldarlıq ideyalarını tərənnümündən yarandığı artıq çoxdan elm aləmində araşdırılaraq öz təsdiqini tapmışdır (Dadaşzadə, 1985: 97).

"Sayacı" tamaşaları bahar münasibəti ilə maldarlıq kultunun şərəfinə təşkil olunurdu və tamaşanın mənşəyi də məhz onunla əlaqələndirilirdi. "Sayaçı" mövsüm tamaşası bütünlüklə bədahətçiliyə əsaslanırdı və bu kultun mənşəyi isə, təbii ki, "Avesta"dan gəlirdi. "Sayaçı" tamaşalarını təşkil edənlər qapı-qapı gəzərək nümayiş zamanı qoyun-keçi dərisinə girir, bəziləri isə züllə, yaxud da saçaqlı qoyun dərisindən çoban papağı geyir və bəzən isə keçi maskası taxırdılar. Onlar müxtəlif vəziyyətlərə uyğun, məzəli xarakterli rəqslər edir, maldarlıqla məşğul olanları tərif edirdilər.

"Qurd və qoyun" adlandırılan belə tamaşalardan biri maldarlıq həyatından bəhs edən mərasim oyununda qurd qoyunu parçalamaq üçün onunla sərt danışır və bəhanə axtarır. Tamaşada iştrak edən oyunçular qurd və qoyun cildində çıxış edirdilər. Nəzmlə söylənilən bu oyunda qurd yırtıcı, qoyun isə balalarının dərdini çəkən mehriban və günahsız təbiətli olurdu. Gərgin konfliktlə yaşanan tamaşa sonda ədalətin təntənəsi ilə başa çatırdı.

"Kosa gəlin" oyununda fəsillərin mübarizəsi fonunda ailə-məişət ideyaları təblığ edilir. Bu tamaşanın mövzusu çox geniş və əhatəlidir. Burda da əsas kosa, keçi, yalançı pəhləvan kimi əsas personajlarla yanaşı köməkçi obrazlar da mövcüd olurdu. Orada formalaşan oyun-tamaşalar uzun bir həyat yolu yaşayaraq müasir dövrümüzə qədər gəlib çatmışdır (Aslanov, 1984: 156).

Zərdüştlük dövrünün qədim Azərbaycanda tamaşa ünsürlərini özündə birləşdirən mərasim tamaşalarından biri də yenə kökünü "Avesta"dan götürən "Baharın qarşılanması" oyunu xüsusi diqqət cəlb edir. Əski mənbələrin birində deyilirdi ki, Baharın qarşılanma bayramı Zərdüştdən cox əvvəl var olmuş və necə əsrlər keçsə də, əzəmətini saxlayıb "Avesta"yadək gəlib çıxarmışdı.

Ümumilikdə bütün Zərdüşt mərasim oyunlarının həyata keçrilməsində oddan istifadə edilərək onun müqəddəsliyini qoruyub saxlamağa çalışırdılar. Çünki, odun vəhşilərdən qorunmaq və həyat şəraitinin yüngüllüyünü təmin etmək üçün əhəmiyyəti də çox böyük idi. Müasir dövrdə yalnız Azərbaycanda keçirilən Novruz bayramı keçirmək üçün od ətrafında insanların toplaşması və kosanın, keçəlin, bahar qızının bu şənlikdə mövcudluğu bu gün də davam etməkdədir (Allahverdiyev, 1978: 97).

Kosa, keçəl meydan tamaşalarından da Azarbaycanın milli xalq teatrının özəyi saılan Qaravəlli xalq oyunları yaranmağa başladı. Qaravəlli tamaşalarında musiqi, rəqs, mahnı, söz, lirik parçalar, kinayəli gülüş, tənqid, mübaliğə yolu ilə ələ salmaq kimi xüsusiyyətlərlə bərabər, şərtilik, lokaniklik və nikbinlik üzvi şəkildə birləşmişdir. Əsası "Avesta"dan qaynaqlanan mövzular sonralar mövzuları şifahi xalq ədəbiyyatının nağıl, lətifə, məzəli hekayə və əfsanələrindən götürməyə başladı. Bu janrlarda daim obraz kimi iştirak edən kosa, ulaq üstündə əyləşib – "Qaravəlli" gəldi - deyə camaatı tamaşaya baxmağa dəvət edirdi. Mahir ifaçı olan kosa həm də tamaşanın təşkilatçısı idi. Qara zurna və nağaranın ucadan səslənməsi tamaşaçıların toplanması üçün vasitə olurdu.

Qaravəllilərdə aktyor ifaçılığı, aktyorun hadisələrə münasibəti tamaşanın satirik təbiətini daha da qüvvətləndirirdi. Bu cür tamaşalarında aktyorlar tez-tez görkəmini dəyişir, müxtəlif heyvan cildinə girirdilər ki, tamaşanın maraq dairəsini daha da genişləndirsin. "Qaravəlli" meydan tamaşalarında oyunçular ən çox kosa, keçi, qoyun, buğa, qurd və keçəl maskalarından istifadə edərək obrazları dəyişdirirdilər (Allahverdiyev, 1976: 174).

Həmişə tənqid hədəfində olan xəsis və tamahkar obrazları Qaravəlli tamaşalarının əsas personajlarından olurdu. Azərbaycan dramaturgiyasının banisi M.F.Axundzadə özünün məhşur "Hacı Qara" komediyasını "Qaravəlli" xalq tamaşası olan "Xəsis"dən götürmüşdür. S.S.Axundov isə "Tamahkar" komediyasını yazarkən əsasən "Tamahkar" xalq oyun tamaşasının motivlərindən isti-

fadə etmişdir. Deməli, klassik dramaturgiyamızın yaranışı da öz köklərini Avestadan yaranan xalq oyun tamaşaları əsasında formalaşmağa başlamışdır.

## Nəticə

Xalqımızın çox qədim zamanlardan bəri həvəslə oynadığı Qaravəlli oyun tamaşalarında teatrla bağlı geniş yaradıcılıq imkanları mövcuddur ki, bunlar da müasir Azərbaycan və dünya teatrlarının inkişafına yaxından köməklik göstərə bilər. Komediya və satira üzərində qurulan Qaravəlli tamaşalarında əsasən daxili çürüklük, yaltaqlıq, eybəcərlik, müftəxorluq, yenilık əleyhinə qarşı çıxma, ictimai təbəqələşmə tənqid olunaraq gülüş və rişxənd hədəfinə çevrilirdi. Əsas personajları Kosa, Keçəl və Bahar qızı olan Qaravəlli oyun tamaşalarında gülüşün də, satiranın da nəcib məqsədləri vardı. Çünki bu mənada gülüş və rişxənd inkar edilir, əvəzində gözəllik tərənnüm edilərək ön plana çəkilirdi. Çox-çox qədim dövrlərdə yaranan bu cür Qaravəlli oyun tamaşaları 16-cı əsrdə Avropada meydana gələn dell'arte komediyaları ilə eyniyyət təşkil edirdi. Dell'arte komediyalarındakı kimi qaravəlli tamaşalarının personajları da məxsusi geyimlərdən, masqa və pariklərdən istifadə edirdilər. Kosa başına keçi buynuzu taxır və uzun saqqal qoyur, Keçəl isə başına qoyun dərisindən parik qoyub qarnını şişirdərdi. Hər iki obraz ala-bəzək paltar geyərdilər. Bahar qızı isə üzərində bahar rəmzləri olan don geyər və başına çiçəklərdən hörülmüş çələng qoyardı.

"Avesta"dan öz qaynaqlarını götürən Azərbaycan xalq oyun tamaşaları olan Qaravəlli oyun tamaşaları bu gün də müasir baxışla münasibət göstərilərək çağdaş teatrımızın inkişafında istinad mənbəyi kimi istifadə olunur. Əsasən Novruz bayramı meydan və teatr tamaşalarında o qaynaqlardan istifadə olunaraq yeni səpkidə tamaşalar hazırlanır. İndi də o cür hazırlanan tamaşalar müasir tamaşaçının maraq dairəsindədir və sevilərək baxılan tamaşalara çevrilməkdə davam edir.

## Ədəbiyyat

1. Allahverdiyev, M. (1978). *Azərbaycan xalq teatrının tarixi*.
2. Allahverdiyev, M. (1976). *Qaravəlli tamaşaları*.
3. Aslanov, E. (1984). *El-oba oyunu xalq tamaşası*.
4. Dadaşzadə, M. (1985). *Azərbaycan xalqının orta əsr mənəvi mədəniyyəti*.
5. Qasımov, Ə. (2016). *Naxçıvan teatrında tərcümə əsərlərinin tamaşaları*.
6. Talıbzadə, A. (2008). *Şərq teatr tarixi*.
7. www.kitabxana.net "Avesta" parçalar elektron kitab №03 (48- 2016).
8. www.kitabxana.net "Avesta" seçilmiş himnlər, (2017).

Daxil oldu: 08.09.2024
Baxışa göndərildi: 17.09.2024
Təsdiq edildi: 25.10.2024
Çap olundu: 30.11.2024

*Elmi Tədqiqat* Beynəlxalq Elmi Jurnal. 2024 / Cild: 4 Sayı: 11 / 57-60
*Scientific Research* International Scientific Journal. 2024 / Volume: 4 Issue: 11 / 57-60 e-ISSN: 2789-6919

https://doi.org/10.36719/2789-6919/39/57-60

**Samirə Rzayeva**
Sumqayıt Dövlət Universiteti
doktorant
samira.rzayeva@sdu.edu.az

# Leksik və semantik perspektivdən emosiya anlayışı: ingilis və Azərbaycan dillərində

**Xülasə**

Bu məqalədə ingilis və Azərbaycan dillərində emosiyaların leksik və semantik aspektləri təhlil edilmişdir. Emosional ifadələrin hər iki dildə fərqli xüsusiyyətlərə malik olduğu göstərilmişdir. İngilis dilində sinonimlərin və frazaların çoxluğu, emosiyaların ifadə zənginliyini artırır. Azərbaycan dilində isə emosional sözlər daha dərin və mədəni kontekstlə bağlı olur. Mədəniyyətin emosiyaların ifadəsinə təsiri də təhlil edilmişdir. İngilis dilində emosiyalar daha çox fərdi təcrübə kimi təqdim edilir, Azərbaycan dilində isə kollektiv təcrübə və sosial dəyərlərlə əlaqələndirilir. Nəticə etibarilə, hər iki dildə emosiyaların ifadəsi müxtəlif dil strukturuna və mədəni dəyərlərə əsaslanır.

***Açar sözlər:*** *emosiyalar, leksik analiz, semantik analiz, ingilis dili, azərbaycan dili, mədəniyyət, dil strukturu*

**Samira Rzayeva**
Sumgait State University
PhD student
samira.rzayeva@sdu.edu.az

# The concept of emotion from a lexical and semantic perspective: in English and Azerbaijani languages

**Abstract**

This article analyzes the lexical and semantic aspects of emotions in English and Azerbaijani languages. The study reveals distinct features of emotional expressions in both languages. In English, the abundance of synonyms and phrases enhances the richness of emotional expression, while in Azerbaijani, emotional words are more profound and culturally contextual. The impact of culture on the expression of emotions was also examined. Emotions in English tend to be represented as individual experiences, whereas in Azerbaijani, they are more connected to collective experiences and social values. Consequently, the expression of emotions in both languages is shaped by differing linguistic structures and cultural norms.

***Keywords:*** *emotions, lexical analysis, semantic analysis, English language, Azerbaijani language, culture, language structure*

## Giriş

Emosiyalar dilin ən dərin və mürəkkəb sahələrindən biridir. İnsan təcrübəsinin müxtəlif aspektlərini əks etdirən emosiyalar, yalnız şəxsi hissləri və təcrübələri deyil, həm də cəmiyyətin kollektiv hisslərini ifadə edir. Dil, bu emosiyaların ifadə edilməsi və paylaşılması üçün ən vacib vasitədir.

Hər iki dil – ingilis və Azərbaycan dili – emosiyaların ifadə olunmasında özünəməxsus xüsusiyyətlərə malikdir. Bu məqalə, emosiyaların leksik və semantik təhlilini həyata keçirərək, onların bu dillərdə necə ifadə olunduğunu, sosial və mədəni fərqlilikləri və dilin struktural xüsusiyyətlərini incələyəcəkdir.

Emosiyaların təhlili, yalnız sözlərin mənasını anlamaqla bitmir. Leksik və semantik təhlil, emosiyaların anlamının və onların dil içindəki strukturlarının necə dəyişdiyini, sözlərin müxtəlif kon

tekstlərdə necə işləndiyini də nəzərə alır. Dilin bu aspektində, mədəniyyət və sosial normativlər də vacib rol oynayır, çünki emosiyalar, yalnız fərdi hisslər deyil, eyni zamanda sosial əlaqələrin və kollektiv təcrübələrin əks olunmasıdır.

## Tədqiqat

Leksik perspektivdən emosiyalar. Leksik analiz, sözlərin mənalarını, xüsusiyyətlərini və istifadə sahələrini öyrənmək məqsədini güdür (Goddard, 2003). Emosional sözlər yalnız sadə duyğuları ifadə etməklə qalmır, həm də insanların sosial və mədəni təcrübələrini, dəyərlərini əks etdirir. Leksik baxımdan emosiyalar, təcrübənin müxtəlif mərhələlərini, dərinliklərini və istiqamətlərini göstərir.

İngilis dilində emosional leksikon. İngilis dilində emosiyalar, müsbət və mənfi hisslər arasında fərqli nüanslarla təmsil olunur. Hər bir emosiyanın daha konkret və xüsusi sinonimləri vardır. Məsələn: *Joy (sevinc)* və *happiness (xoşbəxtlik)* arasında semantik fərq mövcuddur. "*Joy*" daha çox qısa müddətli, anlıq bir sevinc hissini əks etdirir, "*happiness*" isə daha uzunmüddətli və davamlı bir hissi təmsil edir.

*Fear (qorxu)* və *anxiety (narahatlıq)* – bu iki söz, hər nə qədər bir-birinə yaxın olsa da, fərqli səviyyə və intensitetdə qorxu hissini təmsil edir. "*Fear*" ani və təcili bir qorxuya işarə edərkən, "*anxiety*" daha uzunmüddətli və davamlı bir narahatlıq vəziyyətini ifadə edir.

Bundan əlavə, ingilis dilində emosiyalar tez-tez tərkibdə istifadə olunur. Məsələn, *"to feel overwhelmed" (boğulmuş hiss etmək)* və *"to be in a state of euphoria" (eiforiya vəziyyətində olmaq)* kimi ifadələr, daha kompleks emosional vəziyyətləri təsvir edir (Kövecses, 2000).

Azərbaycan dilində emosional leksikon. Azərbaycan dilində də emosiyalar, eyni şəkildə, müsbət və mənfi duyğulara bölünür. Lakin Azərbaycan dilindəki emosional sözlər, çox vaxt birbaşa təcrübə və həyat hadisələri ilə əlaqəlidir:

*Sevinc* – ümumilikdə, gözəl bir hadisə ilə bağlı duyğular, amma həm də uzunmüddətli xoşbəxtlik hissini də əks etdirə bilər. "*Şadlıq*" sözü daha çox sosial bir hadisəni və kollektiv sevinc halını ifadə edir.

*Kədər* – ingilis dilindəki "*sadness*" (*kədər*) sözü ilə eyni mənanı daşısa da, bu, həm də sosial və mədəni bir fenomen kimi daha geniş şəkildə işlənir. Məsələn, "*kədərli olmaq*" bəzən kollektiv, sosial bir hadisə ilə əlaqələndirilə bilər.

Azərbaycan dilində emosional ifadələr çox vaxt birbaşa sosial və mədəni dəyərlərlə əlaqəlidir (İsmayılova, 2010). Məsələn, "*qəzəb*" sözü yalnız fərdi bir hiss deyil, həm də sosial ədalətsizlik və ya qeyri-bərabərlik qarşısında yaranan kollektiv bir hissi əks etdirə bilər.

Semantik perspektivdən emosiyalar. Semantik analiz, sözlərin daha geniş mənalarını və əlaqələrini öyrənir. Emosional sözlər yalnız müəyyən duyğuları təmsil etməklə qalmır, həm də bu duyğuların mədəni, sosial və psixoloji kontekstlərini əks etdirir (Sapir, 1921). Emosiyalar həmçinin çoxsaylı sinonim və tərkiblərlə təmsil olunur, bu da onların semantik zənginliyini göstərir.

İngilis dilində semantik təhlil. İngilis dilində emosiyalar tez-tez həm fərdi, həm də sosial səviyyədə müxtəlif mənalar alır. Məsələn: *Anger (qəzəb)* çox vaxt şəxsi bir təcrübə kimi təqdim olunsa da, sosial kontekstdə, ədalətsizlik və haqsızlıq qarşısında yaranan kollektiv bir hissi də əks etdirə bilər. *Love (sevgi)* həm fiziki, həm də emosional səviyyədə müxtəlif mənalar daşıyır. Sevgi yalnız romantik hisslər deyil, eyni zamanda, dostluq, ailə bağları və cəmiyyətlə əlaqələr şəklində də istifadə olunur (Ekman, 1992).

Bu, ingilis dilindəki emosional ifadələrin mürəkkəbliyini və semantik müxtəlifliyini göstərir.

Azərbaycan dilində semantik təhlil. Azərbaycan dilində də emosiyalar daha geniş bir semantik kontekstdə işlədilir. Məsələn: *Kədər* - sadəcə təbii bir hiss olaraq deyil, həm də bir mədəniyyətin və tarixən yaşanan travmaların nəticəsi olaraq təqdim edilir (Vəliyev, 2007). "*Kədər*" Azərbaycan ədəbiyyatında və mədəniyyətində dərin bir yeri olan emosional vəziyyətdir.

Emosiyalar və Mədəniyyət. Mədəniyyət, emosiyaların ifadə olunmasında vacib rol oynayır (Wierzbicka, 1999). Hər iki dil, emosiyaların yalnız fərdi hisslər deyil, eyni zamanda mədəni və sosial normativlərə bağlı olduğunu göstərir. Məsələn, Azərbaycan mədəniyyətində emosional ifadələr daha çox sosial əlaqələr və kollektiv təcrübələrlə əlaqəlidir (İsmayılova, 2010). Azərbaycan ədəbiyyatında və musiqisində kədər və sevgi kimi emosiyalar çox daha dərin şəkildə işlənir.

İngilis dilində isə emosiyalar daha çox fərdi təcrübə olaraq təqdim olunur. İngilis cəmiyyətində emosional ifadələr daha çox şəxsiyyətin özünü təmsil etməsi ilə bağlıdır və kollektiv emosiyalar daha az vurğulanır.

*Fear — "She could hardly breathe from the fear."*
*Sadness — "The sadness in her eyes was unbearable."*
*Love — "His love for her was evident in every gesture."*
*Qəzəb — "Onun qəzəbi məni qorxutdu."*
*Sevinc — "Sevincini bölüşmək üçün dostlarını çağırdı."*
*Kədər — "Kədərli idi, amma bir söz demədi."*

Bu nümunələr emosiyaların dilin fərqli sahələrində necə ifadə olunduğunu və bu ifadələrin mədəniyyətə necə bağlı olduğunu göstərir.

Emosiyaların leksik və semantik analizi, dilin psixoloji, sosial və mədəni aspektlərini dərinliklə öyrənməyə imkan verir. İngilis və Azərbaycan dillərində emosional ifadələr bir çox cəhətdən oxşar olsa da, hər iki dilin özünəməxsus xüsusiyyətləri vardır:

*Dil strukturunda fərqlər:* İngilis dilində emosional sözlər geniş sinonim və frazalardan ibarətdir, bu da ifadələrin zənginliyini təmin edir. Məsələn, *"joy", "happiness", "delight", "bliss"* kimi müxtəlif sinonimlər emosiyanın müxtəlif intensivliyini göstərir. Azərbaycan dilində isə emosional ifadələr daha çox konkret və dərin mənalı sözlər üzərində qurulur. Məsələn, *"sevinc"* və *"şadlıq"* hər nə qədər oxşar mənaya malik olsalar da, sosial və kontekstual fərqliliklər göstərir.

*Mədəniyyət və sosial normativlər:* İngilis dilində emosiyaların ifadəsi daha çox fərdi təcrübəyə əsaslanır. İnsanların şəxsi hissləri və təcrübələri ön plana çıxarılır. Azərbaycan dilində isə emosional ifadələr kollektiv təcrübələr və sosial dəyərlərlə sıx bağlıdır. Məsələn, Azərbaycan ədəbiyyatında "*kədər*" və "*qəzəb*" kimi emosiyalar çox vaxt milli tarix və mədəni hadisələrlə əlaqəli təqdim edilir.

*Psixoloji yanaşma:* İngilis dilində emosiyalar tez-tez psixoloji tədqiqatlarda ayrı-ayrı fərdlərin təcrübələri üzərində analiz edilir. Məsələn, *"depression" (depressiya), "anxiety" (narahatlıq)* kimi emosional vəziyyətlər fərdi psixoloji problemlərlə əlaqələndirilir. Azərbaycan dilində isə emosiyalar, xüsusilə "*kədər*" və "*sevgi*", daha çox sosial bağlar və ailə münasibətləri çərçivəsində təhlil olunur.

*Ədəbiyyat və sənət:* Hər iki dildə ədəbiyyat və sənət nümunələri emosiyaların ifadəsi üçün zəngin bir mənbədir. İngilis poeziyasında romantik və fərdi hisslərə çox yer verilir, məsələn, William Wordsworth-un təbiət və sevgi mövzusundakı şeirləri. Azərbaycan ədəbiyyatında isə emosiyaların kollektivi, məsələn, Nizami Gəncəvinin "Leyli və Məcnun" əsərindəki sevgi və ayrılıq hissləri ilə təmsil olunur.

## Nəticə

Bu məqalədə ingilis və Azərbaycan dillərində emosiyaların leksik və semantik aspektləri təhlil edildi. Əsas nəticələr aşağıdakılardır:

*Dil ifadələrinin zənginliyi:* Hər iki dil, emosiyaların ifadəsi üçün geniş leksik fonda malikdir. Lakin ingilis dilində sinonimlər və frazalar çox müxtəlif olduğu halda, Azərbaycan dilində emosional ifadələr daha dərin, sosial kontekstlə bağlıdır.

*Mədəniyyətin rolu:* Mədəniyyət, emosiyaların ifadəsi və qavranılması üzərində böyük təsir göstərir. Azərbaycan mədəniyyətində emosiyalar daha çox kollektiv və sosial hadisələrlə əlaqəli olduğu halda, ingilis mədəniyyətində fərdi emosional təcrübələr daha çox vurğulanır.

*Dillərin psixoloji təsiri:* Hər iki dilin emosional ifadələri, dil daşıyıcılarının psixoloji vəziyyətinə də təsir göstərir. Azərbaycan dilində kollektiv emosiyalar insanlarda daha çox empatiya və sosial bağlılıq hissi yaradır, ingilis dilində isə fərdi emosiyalar şəxsi inkişaf və fərdi təcrübələrə fokuslanır.

## Ədəbiyyat

1. İsmayılova, S. (2010). *Azərbaycan dilində emosional leksikonun təhlili*. Bakı Universiteti Nəşriyyatı.
2. Vəliyev, Ə. (2007). *Azərbaycan dilində mədəniyyət və dil münasibətləri*. Nurlan Nəşriyyatı.
3. Ekman, P. (1992). An Argument for Basic Emotions. *Cognition & Emotion*, 6(3), 169-200.
4. Goddard, C. (2003). *Cross-linguistic Semantics*. John Benjamins Publishing.
5. Kövecses, Z. (2000). *Metaphor and Emotion: Language, Culture, and Body in Human Feeling.* Cambridge University Press.
6. Sapir, E. (1921). *Language: An Introduction to the Study of Speech.* Harcourt, Brace & Company.
7. Wierzbicka, A. (1999). *Emotions Across Languages and Cultures: Diversity and Universals*. Cambridge University Press.
8. Lakoff, G., & Johnson, M. (1980). Metaphors We Live By. University of Chicago Press.

Daxil oldu: 18.09.2024
Baxışa göndərildi: 02.10.2024
Təsdiq edildi: 24.10.2024
Çap olundu: 30.11.2024

https://doi.org/10.36719/2789-6919/39/61-66

**Гульшан Акперова**
Академия Государственного Управления
при Президенте Азербайджанской Республики
магистрант
gulyamamedova703@gmail.com

# Роль молодежных общественных организаций в стимулировании общественно-политической активности молодежи

**Аннотация**

Настоящее исследование посвящено изучению роли молодежных общественных организаций в стимулировании общественно-политической активности молодежи, что является значимым аспектом развития демократического общества. В работе использовались качественные методы, включая полуструктурированные интервью и контент-анализ документов, что позволило выявить ключевые факторы, влияющие на вовлеченность молодежи в общественные и политические процессы. Молодежные общественные организации играют ключевую роль в формировании гражданского сознания и активного участия молодежи в общественно-политических процессах. Результаты исследования показали, что такие организации способствуют развитию лидерских качеств, повышению уровня политической грамотности и формированию чувства гражданской ответственности у молодых людей. Однако выявлены барьеры, такие как недостаток опыта у лидеров, слабая информированность о предоставляемых возможностях и ограниченные ресурсы для реализации инициатив, которые требуют системного подхода к их устранению. Образовательные программы и сетевое взаимодействие признаны наиболее эффективными инструментами, однако требуют совершенствования для повышения их доступности и качества. Таким образом, молодежные общественные организации играют значительную роль в формировании активного гражданского общества, но их потенциал может быть реализован в полной мере только при устранении выявленных препятствий.

***Ключевые слова:*** *общественные организации, молодежь, лидерство, политическая активность, гражданское общество*

**Gülşən Əkbərova**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
gulyamamedova703@gmail.com

# Gənclər üçün nəzərdə tutulan ictimai təşkilatların gənclərin ictimai-siyasi fəallığının stimullaşdırılmasında rolu

**Xülasə**

Bu tədqiqat gənclərin ictimai-siyasi fəallığının stimullaşdırılmasında gənclər üçün nəzərdə tutulan ictimai təşkilatların rolunun öyrənilməsinə həsr edilmişdir ki, bu da demokratik cəmiyyətin inkişafı üçün əhəmiyyətli bir aspektdir. Tədqiqat zamanı semi-strukturlu müsahibələr və təşkilatların sənədlərinin məzmununun təhlili kimi keyfiyyət metodlarından istifadə olunmuşdur. Gənclər üçün nəzərdə tutulan ictimai təşkilatlar vətəndaş şüurunun formalaşdırılmasında və gənclərin ictimai-siyasi proseslərdə fəal iştirakının təşviq edilməsində əsas rol oynayır ki, bu da onları müasir demokratik cəmiyyətin ayrılmaz elementi edir. Araşdırmanın nəticələri göstərmişdir ki, belə təşkilatlar gənclərin liderlik bacarıqlarının inkişafına, siyasi savadlılıq səviyyəsinin artırılmasına və vətəndaş məsuliyyəti hissinin formalaşmasına töhfə verir. Bununla yanaşı, liderlərin təcrübə

çatışmazlığı, təqdim edilən imkanlar haqqında zəif məlumatlılıq və təşəbbüslərin həyata keçirilməsi üçün məhdud resurslar kimi maneələr aşkar edilmişdir ki, bunların aradan qaldırılması sistemli yanaşma tələb edir. Təhsil proqramları və şəbəkələşmə ən təsirli alətlər kimi tanınmışdır, lakin onların daha geniş əlçatanlığı və keyfiyyətinin artırılması üçün təkmilləşdirilməsi tələb olunur. Beləliklə, gənclərin ictimai-siyasi həyata fəal cəlb edilməsi baxımından bu təşkilatlar əhəmiyyətli rol oynayır, lakin aşkar edilmiş problemlərin həlli onların potensialını tam şəkildə reallaşdırmağa imkan verəcəkdir.

***Açar sözlər:*** *ictimai təşkilatlar, gənclər, liderlik, siyasi fəallıq, vətəndaş cəmiyyəti*

**Gulshan Akbarova**
Academy of Public Administration under the President of the Republic of Azerbaijan
Master's student
gulyamamedova703@gmail.com

# The Role of Youth Public Organizations in Stimulating The Socio-Political Activity of Young People

## Abstract

This article is focused on the involvement of a youth public organization in stimulating the socio-political activity of young people as a significant direction within the development of a democratic society. Qualitative methods, semi-structured interviews, and content analysis of organizational documents. Youth public organizations actively contribute to the development of civic consciousness and the active participation of young people in socio-political processes, enabling them to become an indispensable element of modern democratic society. It was found that such organizations make a significant contribution to developing certain leadership skills, increasing the level of political literacy, and encouraging civic responsibility among adolescents. Meanwhile, there were barriers like a lack of experience in the leadership, a lack of awareness about the opportunities available, and a shortage of resources to implement initiatives, all of which could only be removed through a systematic approach. Besides, educational programs and networking have been identified as the best tools, though their accessibility and quality need to be enhanced for wider access. Consequently, youth public organizations can play a great role in the development of active civic society, but their potential can be fully realized only in case the identification of challenges has further on taken place.

***Keywords:*** *public organizations, youth, leadership, political activity, civil society*

## Введение

Актуальность данной темы обусловлена возрастающим интересом молодежи к политической жизни, усилением общественного запроса на инновационные подходы к вовлечению молодых людей в принятие решений, а также необходимостью создания устойчивых механизмов для поддержки их инициатив. Молодежные общественные организации предоставляют возможности для саморазвития и социальной реализации, создавая уникальную среду, где молодежь может выражать свои идеи, бороться за справедливость и добиваться изменений. Таким образом, исследование роли молодежных организаций в стимулировании общественно-политической активности молодежи является чрезвычайно важным для понимания современных тенденций развития гражданского общества.

## Исследование

Молодежные общественные организации, как институционализированные структуры, играют значительную роль в процессе формирования общественно-политической активности молодежи, и их функции можно анализировать через призму ряда теоретических подходов. В рамках теории гражданского общества, предложенной Р. Патнэмом, подчеркивается, что молодежные организации способствуют развитию социальной капитала, создавая условия

